QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

**BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!**
*Məhəmməd Peyğəmbər (S.Ə.S.)*

Fevral 2014
2 (1056)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## “Xocalıya ədalət” kampaniyasının keçirilməsi ilə bağlı tədbirlər haqqında

### Azərbaycan Respublikası Prezidentinin Sərəncamı

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq qərara alıram:

1. Beynəlxalq səviyyədə keçirilən “Xocalıya ədalət” kampaniyasının əhəmiyyətini nəzərə alaraq, Azərbaycan Respublikasının 2014-cü il dövlət büdcəsində nəzərdə tutulmuş Azərbaycan Respublikası Prezidentinin Ehtiyat Fondundan Azərbaycan Respublikasının Gənclər və İdman Nazirliyinə 1,0 (bir) milyon manat ayrılsın.

2. Azərbaycan Respublikasının Maliyyə Nazirliyi bu Sərəncamın 1-ci hissəsində nəzərdə tutulan məbləğdə maliyyələşməni müəyyən olunmuş qaydada təmin etsin.

3. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 13 fevral 2014-cü il*

# Xocalı soyqırımı - bəşəriyyətə qarşı yönəldilmiş cinayət aktı

### ADPU-da Xocalı soyqırımının iyirmi ikinci ildönümünə həsr edilmiş anım mərasimi keçirilib

**Tarix boyu minüzlü, minsifətli ermənilər öz havadarlarının himayəsi və hərtərəfli dəstəyi ilə xalqımıza qarşı böyük faciələr, müsibətlər törətmişlər. Namərd və xain qonşularımız olan ermənilərin xalqımıza qarşı bu düşmən mövqeyi son iki əsrdə daha amansız və dəhşətli xarakter almışdır. Bu baxımdan ermənilərin 1992-ci il fevral ayının 25-dən 26-na keçən gecə törətdikləri Xocalı soyqırımı xalqımızın və eləcə də bütün bəşəriyyətin tarixinə ən qəddar və vəhşi cinayət aktlarından biri kimi daxil olmuşdur. Bu günlər respublikamızda və dünyanın bir çox ölkələrində Xocalı soyqırımının iyirmi ikinci ildönümünə həsr edilmiş müxtəlif tədbirlərdə faciə qurbanlarının xatirəsi bir daha yad edilir, soyqırımının baş verdiyi dövrün tarixi-siyasi şəraiti ətraflı təhlil edilir və eyni zamanda faciəyə verilən siyasi-hüquqi qiymətə xüsusi toxunulur. Bu il fevral ayının 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Xocalı soyqırımının iyirmi ikinci ildönümünə həsr edilmiş anım mərasimində də faciənin səbəb və nəticələri, həmçinin bu soyqırımının beynəlxalq miqyasda tanınması istiqamətində həyata keçirilən tədbirlər barədə ətraflı danışılmışdır.**




ADPU-da Xocalı soyqırımının iyirmi ikinci ildönümünə həsr edilmiş anım mərasimi faciə qurbanlarının xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsilə başladı. ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov anım mərasimini giriş sözü ilə açaraq bildirmişdir ki, Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev bu il fevral ayının 13-də “Xocalıya ədalət!” kampaniyasının keçirilməsi ilə bağlı tədbirlər haqqında Sərəncam imzalamışdır. Həmin Sərəncama əsasən beynəlxalq səviyyədə keçirilən “Xocalıya ədalət!” kampaniyasının əhəmiyyəti nəzərə alınaraq 2014-cü il dövlət büdcəsində nəzərdə tutulmuş Azərbaycan Respublikası Prezidentinin Ehtiyat Fondundan Gənclər və İdman Nazirliyinə 1 milyon manat vəsaitin ayrılması nəzərdə tutulmuşdur.

Bununla yanaşı, Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri, akademik, hörmətli Ramiz Mehdiyevin bu il yanvar ayının 27-də imzaladığı sərəncamla “Xocalı soyqırımının iyirmi ikinci ildönümünün keçirilməsinə dair tədbirlər planı” təsdiq edilmişdir. Tədbirlər planında Bakı şəhərinin Xətai rayonunda, Goranboy rayon mərkəzində və Ağcakənd qəsəbəsində Xocalı soyqırımı qurbanlarının xatirəsinə ucaldılmış abidələrin önünə əklil qoyulması mərasimlərinin keçirilməsi, ictimaiyyət nümayəndələri tərəfindən Şəhidlər Xiyabanının ziyarət edilməsi, respublikamızın xarici ölkələrdəki səfirliklərində, nümayəndəliklərində və diaspor təşkilatlarında bu soyqırımı ilə bağlı mətbuat konfranslarının, anım mərasimlərinin və digər tədbirlərin təşkili, xarici və yerli kütləvi informasiya vasitələrində, teleradio kanallarında, İnternet şəbəkəsində qanlı qırğını əks etdirən məlumatların yayılması və mütəmadi olaraq yenilənməsi nəzərdə tutulmuşdur. Eyni zamanda həmin sərəncamda idarə və təşkilatlarda, teatr-konsert müəssisələrində, sərgi salonlarında, ali və orta məktəblərdə xatirə gecələri, foto-rəsm sərgiləri, şahidlərlə görüşlər və digər tədbirlərin keçirilməsi, milli-azadlıq uğrunda mübarizəyə həsr olunmuş sənədli və bədii filmlərin nümayiş etdirilməsi öz əksini tapmışdır.

Faciənin iyirmi ikinci ildönümü ilə əlaqədar rəsmi dövlət strukturları rəhbərlərinin, millət vəkillərinin və ziyalıların iştirakı ilə xocalılıların müvəqqəti məskunlaşdıqları şəhər və rayonlarda-Bakı, Sumqayıt, Gəncə, Mingəçevir, Şəki, Goranboy, Bərdə, Sabirabad, Göyçay, Zaqatala, Oğuz və Balakən rayonlarında şəhid ailələrinə yardımlar ediləcəkdir. Bu gün bütün təhsil müəssisələrində ilk dərslər bu faciəyə həsr olunub, ayın 26-da saat 17.00-da bütün ölkə ərazisində Xocalı soyqırımı qurbanlarının xatirəsi bir dəqiqəlik sükutla yad ediləcəkdir.

Onu da qeyd edək ki, Təhsil Naziri cənab Mikayıl Cabbarov bu il fevral ayının 18-də təhsil müəssisələrində bəşər tarixinə XX əsrin ən dəhşətli faciələrindən biri kimi daxil olmuş Xocalı soyqırmının iyimi ikinci ildönümünün keçirilməsi barədə müvafiq əmr imzalamışdır və həmin əmrə əsasən təhsil müəssisələrində keçiriləcək tədbirlər planı təsdiq edilmişdir.

Yuxarıda göstərilən sənədlərə əsasən Azərbaycan Dövlət Pedaqoji Universitetində imzalanmış müvafiq əmr əsasında universitetdə Xocalı soyqırımının iyirmi ikinci ildönümünə həsr edilmiş müxtəlif tədbirlər keçirilir. Belə ki, faciənin ildönümü ərəfəsində universitetimizin bütün fakültələrində Xocalı soyqırımına həsr edilmiş fotostendlər yaradılıb, ədəbi-bədii gecələr, eyni zamanda soyqrımının şahidi olan insanlarla görüşlər keçirilib, azadlıq uğrunda mübarizəyə həsr olunmuş sənədli və bədii filmlər nümayiş etdirilib. Fevral ayının 21-də ADPU-nun tələbə-gəncləri Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqı ilə birlikdə bu təşkilatın Xocalı soyqırımı haqqında həqiqətlərin dünya ictimaiyyətinə çatdırılması məqsədi ilə keçirdiyi e.mail aksiyasında fəal iştirak etmişdir. Tələbə Gənclər Təşkilatı həmçinin Kompyuter Mərkəzi ilə birlikdə fevralın 23-də universitetin İnternet saytına Xocalı soyqırımını əks etdirən materiallar daxil edəcəkdir. Bu gün universitetin bütün fakültələrində ilk dərs saatları Xocalı soyqırımına həsr edilmişdir.

Rektor Y.Məmmədov çıxışına davam edərək bildirmişdir ki, 1992-ci il fevralın 25-dən 26-na keçən gecə Xocalıda baş vermiş dəhşətli faciədən iyirmi iki il ötür. Xocalı faciəsi XX əsrdə ermənilər tərəfindən xalqımıza qarşı törədilmiş növbəti kütləvi qırğın olmaqla bərabər, həm də Azərbaycanın ərazi bütövlüyünə və dövlət müstəqilliyinə qarşı yönəlmiş ənənəvi terror siyasətinin tərkib hissəsidir. Bu soyqırımı həm də bəşəriyyətə və insanlığa qarşı yönəlmiş ən qəddar cinayətlərdən biridir. Beynəlxalq hüququn norma və prinsiplərinə əsla məhəl qoyulmadan həyata keçirilmiş bu soyqırımı aktı xalqımızın azadlıq və müstəqillik istəyini məhv etməyə yönəldilmişdi. Digər tərəfdən, Xocalı soyqırımı ermənilər tərəfindən burada törədilmiş birinci qətliam deyildi:

**(Davamı 2-ci səhifədə)**

# Xocalı soyqırımı - bəşəriyyətə qarşı yönəldilmiş cinayət aktı

## ADPU-da Xocalı soyqırımının iyirmi ikinci ildönümünə həsr edilmiş anım mərasimi keçirilib

(Əvvəli 1-ci səhifədə)



mənfur ermənilər hələ 1906 və 1918-ci illərdə bu şəhəri yandırıb külə döndərmiş, əhalisini isə qırıb məhv etmişdilər. Namərd və xain qonşularımız olan ermənilər keçmiş Sovet Ordusunun Xankəndidə yerləşən 366-cı motoatıcı alayının köməyi ilə 1992-ci il fevralın 25-dən 26-na keçən gecə 7 min əhalisi olan Xocalıda daha dəhşətli və daha qəddar bir cinayət törətdilər. Xocalı soyqırımınadək bu rayonun Kərkicahan, Əsgəran rayonunun Qaradağlı, Qazax rayonunun Bağanıs Ayrım kəndləri də erməni vəhşiləri tərəfindən məhv edilmişdi.

Xocalı faciəsi bəşər tarixində misli görünməmiş bir cinayət aktıdır. Həmin o dəhşətli gecədə Xocalı şəhəri sakinləri ilə birgə tamamilə məhv edildi. Faciə zamanı 613 nəfər, o cümlədən 106 qadın, 63 uşaq, 70 qoca ermənilər tərəfindən xüsusi qəddarlıqla qətlə yetirildi, 1275 nəfər dinc sakin əsir götürüldü, 150 nəfər isə itkin düşdü, 8 ailənin həyatına son qoyuldu, 25 uşaq hər iki valideynindən, 130 uşaq isə valideynlərinin birindən məhrum oldu, 487 dinc sakin ağır yaralandı. Bu, İkinci Dünya müharibəsində faşizmin törətdiyi dəhşətli qırğınlardan sonra müasir dövrdə erməni separatçı-terrorçuları ilə birlikdə Ermənistan hərbi qüvvələrinin və Rusiyanın 366-cı motoatıcı alayının əsgərlərinin törətdiyi ən kütləvi və ən dəhşətli soyqırımıdır. Beynəlxalq qanunlara görə, hər hansı bir ərazi silahlı qüvvələr tərəfindən mühasirəyə alınarkən dinc mülki əhalinin həmin ərazidən çıxması üçün bir koridor qoyulur. Mənfur ermənilər də guya Xocalıda dinc əhalinin çıxması üçün koridor qoymuşdular, lakin həmin yola üz tutan xocalıları erməni hərbçiləri elə həmin yoldaca ya əsir götürür, ya da vəhşicəsinə qətlə yetirirdilər. Bir çox meyitlərin bədənləri süngü ilə deşik-deşik edilmiş, başlarının dərisi soyulmuş, gözləri çıxarılmış, burun və qulaqları kəsilmişdi. Xocalıda köməksiz uşaqlara qarşı törətdikləri vəhşilikləri ermənilər özləri də etiraf ediblər. 1996-cı ildə erməni yazıçısı Zori Balayanın müəllifliyi ilə işıq üzü görmüş "Ruhumuzun dirilməsi" adlı kitabın 260-262-ci səhifələrində yazılıb: "Mən və Xaçatur onların saxlandığı zirzəmiyə daxil olanda əsgərlərimiz artıq bir uşağı pəncərəyə hörmüşdülər. Onun çox səs-küy salmaması üçün ölmüş atasının dərisini qoparıb ağzına soxmuşdular. Sonra mən 13 yaşlı bir türkün baş, sinə və qarnından dərisini qopardım. Təxminən 7 dəqiqə sonra uşaq qan itkisindən öldü. Mən birinci dərəcəli həkim kimi humanistəm, ona görə də uşağın başına gətirdiyim zülmlərdən xoşbəxtlik hiss eləmirdim, lakin daxilən sevinirdim. Xaçatur uşağın cəsədini tikə-tikə doğradı və yem kimi itlərə atdı. Həmin axşam biz daha üç türk törəməsinin başına həmin oyunu açdıq. Mən patriot vətəndaş kimi erməni borcumu yerinə yetirirdim".

Xocalı hərbi cinayəti, Xocalı soyqırımı işğalçı Ermənistanın Azərbaycana qarşı hərbi təcavüzünün əsl mahiyyətini və erməni vəhşiliyinin dəhşətlərini bütün çılpaqlığı ilə üzə çıxardı. Bu dəhşətli hadisə həm də Azərbaycanın Qarabağ müharibəsində aldığı ən böyük zərbə idi. Bu ağır zərbənin və hərbi uğursuzluğun ən böyük səbəbləri isə təbii ki, həmin dövrdə Azərbaycanın rəhbərliyində təmsil olunan şəxslərin məsuliyyətsizliyi, səriştəsizliyi və ən başlıcası isə, xalqımızın milli maraqlarına xəyanət etmələri olmuşdur.

Rektor Y.Məmmədovun maraqlı və məzmunlu çıxışında Xocalı faciəsinin baş verdiyi dövrün ictimai-siyasi və hərbi vəziyyətinin təhlili də geniş yer aldı. Rektor qeyd etdi ki, Xocalı 1991-ci ilin may ayından blokada vəziyyətində yaşayırdı, yalnız telefon əlaqəsi var idi. Xocalının erməni hərbi birləşmələri tərəfindən mühasirəsi isə faktiki olaraq 1991-ci ilin oktyabrından başlanmışdı. Belə ki, Xankəndi ilə Əsgəran arasında strateji əhəmiyyətli yer sayılan Xocalının ələ keçirilməsi ermənilər üçün böyük əhəmiyyət kəsb edirdi. Elə buna görə də, düşmən öz canlı hərbi qüvvə və texnikasını Xocalı ətrafında cəmləşdirmişdi. Mühasirə şəraitində yaşayan və mübarizə aparan Xocalıya Bakıdan lazımi köməyin göstərilməməsi də bu rayonun sakinlərinin vəziyyətini çox çətinləşdirirdi. Həmin dövrdə Xocalı şəhəri əsasən atıcı silahlarla silahlanmış yerli könüllü dəstələr, milis və Milli Ordunun birləşmiş qüvvələri tərəfindən müdafiə olunurdu. Yalnız faciə ərəfəsində edilən çoxsaylı müraciətlərdən sonra Bakıdan Xocalıya 16 nəfər hərbiçi göndərilmişdi. 1991-ci il oktyabrın 30-dan Xocalı ilə quru əlaqəsi kəsilmişdi. 1992-ci il yanvarın 2-dən sonra isə Xocalıya hətta, elektrik enerjisi belə verilmirdi. 1992-ci il yanvarın 28-də Ağdam-Şuşa reysi ilə uçan mülki vertolyotun vurulmasından sonra Xocalı ilə hava əlaqəsinə də son qoyuldu. Beləcə, Xocalı canlı qüvvə və silah-sursat sarıdan çox üstün olan düşmənlə mübarizədə tək qalmışdı. Xocalının mühasirə həlqəsi günü-gündən daralırdı. Bakıya, mərkəzi hakimiyyətə kömək üçün edilən çoxsaylı müraciətlərə isə cavab verilmirdi.

1992-ci ilin yanvarın sonu, fevralın əvvəlləri Kərkicahan, Quşçular, Malıbəyli və Qaradağlı kəndləri ermənilər tərəfindən işğal edildi. Bir müddət öncə - 1992-ci il yanvarın 26-da Daşaltıda keçirilmiş uğursuz hərbi əməliyyat nəticəsində isə xeyli sayda döyüşçümüz həlak olmuş, əsir götürülmüş, itkin düşmüşdü. Həmin dövrdə ölkə rəhbərliyində təmsil olunan şəxslər isə sanki bunu görmürdülər. Güc strukturları rəhbərlərinin tez-tez dəyişdirilməsi də hərbi uğursuzluqlarımızın əsas səbəblərindən birinə çevrilmişdi. Xocalının müdafiəsi üçün dövlət səviyyəsində zəruri əməli tədbirlərin həyata keçirilməməsi nəticə etibarilə bu faciəyə şərait yaratdı.

Xocalı soyqırımının beynəlxalq ictimaiyyətə çatdırılması ilə bağlı əməli tədbirlər yalnız ulu öndərimiz Heydər Əliyevin xalqımızın çox böyük istəyi və inadlı tələbi ilə Azərbaycanda yenidən ali dövlət hakimiyyətinə qayıtmasından sonra həyata keçirildi. Məhz ümummilli liderimiz Heydər Əliyev respublikamızda yenidən hakimiyyətə qayıtdıqdan sonra işğalçı Ermənistanın Azərbaycana qarşı həyata keçirdiyi soyqırımı və terror siyasətinin mahiyyətini özündə dolğun əks etdirən faktların dünya ictimaiyyətinə çatdırılmasını müstəqil dövlətimizin xarici siyasətinin ən mühüm vəzifələrindən biri kimi müəyyənləşdirdi və bu vacib istiqamətdə səmərəli əməli tədbirlər həyata keçirdi. Bu məqsədlə atılan addımlardan biri isə Xocalı faciəsinə siyasi-hüquqi qiymətin verilməsi oldu. Xalqımızın dahi lideri Heydər Əliyevin təşəbbüsü ilə 1994-cü il fevralın 24-də Milli Məclisdə «Xocalı Soyqırımı Günü haqqında» qərar qəbul edildi, BMT-yə və dünyanın aparıcı dövlətlərinə bu faciənin mahiyyətini açıqlayan və beynəlxalq ictimaiyyəti erməni terrorçuluğuna qarşı təsirli tədbirlər görməyə çağıran müraciət ünvanlandı. Ulu öndərimiz Heydər Əliyev «Xocalı soyqırımı qurbanlarının xatirəsinə sükut dəqiqəsi edilməsi haqqında» 25 fevral 1997-ci il tarixli müvafiq sərəncam imzalamışdır ki, bu sərəncama əsasən hər il fevralın 26-sı saat 17.00-da Azərbaycan Respublikasının ərazisində Xocalı soyqırımı qurbanlarının xatirəsinə ehtiram əlaməti olaraq sükut dəqiqəsi elan edilir.

Xocalı faciəsi zamanı həlak olmuş soydaşlarımızın ailələri hər bir zaman Azərbaycan Prezidenti cənab İlham Əliyevin diqqət mərkəzindədir. Respublikamızın 48 rayonunda məskunlaşmış xocalılara dövlət səviyyəsində hər cür qayğı və köməklik göstərilir. Bir faktı xüsusi qeyd edək ki, son illər Xocalı faciəsinin beynəlxalq miqyasda tanınması istiqamətində bir sıra uğurlu addımlar atılmışdır. Xatırladaq ki, Azərbaycan Prezidenti cənab İlham Əliyev 2012-ci il yanvar ayının 17-də Xocalı soyqırımının iyirminci ildönümü haqqında Sərəncam imzaladı və həmin Sərəncama uyğun olaraq Xocalı soyqırımı ölkəmizdə dövlət səviyyəsində keçirildi. 2012-ci il fevral ayının 26-da xalqımız dövlət başçımız cənab İlham Əliyevin rəhbərliyi ilə Bakıda Xocalı faciəsinin iyirminci ildönümü ilə əlaqədar möhtəşəm bir yürüş keçirdi ki, bu da dünya ictimaiyyətinin diqqətini yenidən Xocalı soyqırımına yönəltdi.

Bu il də Xocalı faciəsi ilə əlaqədar dünyanın bir çox ölkələrində müxtəlif tədbirlər - konfranslar, dəyirmi masalar, etiraz aksiyaları və digər tədbirlər həyata keçirilir və belə tədbirlərin gələcəkdə də davam etdirilməsi nəzərdə tutulur. Ölkənin birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, Yeni Azərbaycan Partiyasının Sədr müavini, millət vəkili Mehriban Əliyeva bütövlükdə Azərbaycan həqiqətləri, o cümlədən Xocalı faciəsi haqqında beynəlxalq ictimaiyyətin lazımi səviyyədə məlumatlandırılması üçün səmərəli əməli fəaliyyət göstərir. Heydər Əliyev Fondunun vitse-prezidenti Leyla xanım Əliyevanın təşəbbüsü ilə artıq altı ildir ki, beynəlxalq miqyasda "Xocalıya ədalət!" kampaniyası həyata keçirilir. Hazırda Xocalı faciəsinin mənəvi və siyasi-hüquqi səviyyədə tanınmasına yönəlmiş bu kampaniya dünyanın bir çox ölkələrində uğurla gerçəkləşdirilir. Bugünədək 10 ölkə Xocalı faciəsini soyqırımı kimi tanıyıb. Bu kampaniya çərçivəsində dünyanın 40-dək ölkəsində 200-dən çox müxtəlif tədbir keçirilib, 10 qətnamə qəbul edilib. Bu il də fevral ayı Ukraynada «Xocalı ayı» elan edilib və ukraynalı gənclərin, ziyalıların, ictimai xadimlərin də fəal iştirakı ilə bu ölkənin bir çox şəhərlərində müxtəlif tədbirlər gerçəkləşdirilir. Eyni zamanda dünyanın bir çox ölkələrində, o cümlədən ABŞ, Türkiyə, Gürcüstan, Rusiya, Böyük Britaniya, Almaniya, Polşa, Rumıniya, Kanada, Belçika və digər ölkələrdə Xocalı soyqırımının iyirmi ikinci ildönümünə həsr edilmiş müxtəlif tədbirlər keçirilir. Bu baxımdan, qardaş Türkiyə Azərbaycana böyük siyasi və mənəvi dəstək verir. Artıq Türkiyənin bir çox mərkəzi şəhərlərində Xocalı soyqırımının iyirmi ikinci ildönümünə həsr edilmiş müxtəlif tədbirlər keçirilib və həmin tədbirlər davam etdirilir. Türkiyə Böyük Millət Məclisində Xocalı soyqırımının ildönümü ilə əlaqədar müzakirələrin aparılacağı gözlənilir.

Bütün bunlarla yanaşı, ölkə parlamenti də mütəmadi olaraq Xocalı soyqırımı ilə əlaqədar xüsusi iclaslar keçirir və müvafiq bəyanatlar qəbul edir. Həmin bəyanatlarda birmənalı şəkildə bildirilir ki, müstəqil Azərbaycan dövləti mövcud imkanlardan maksimum yararlanaraq, ərazi bütövlüyümüzü təmin edəcək, Xocalı faciəsinin əsl beynəlxalq hüquqi-siyasi qiymət almasına, onun ideoloqlarının, təşkilatçılarının və icraçılarının cəzalandırılmasına nail olacaqdır. Eyni zamanda Azərbaycan Respublikasının İnsan Hüquqları üzrə Müvəkkili (Ombudsman) hər il Xocalı soyqırımı ilə bağlı dünya ictimaiyyətinə müraciətlər ünvanlayır. Həmçinin Diasporla İş üzrə Dövlət Komitəsi və ölkəmizin vətəndaş cəmiyyəti institutlarının təmsilçiləri-qeyri-hökumət təşkilatlarının, ictimai birliklərin nümayəndələri Xocalı faciəsi ilə bağlı dünya ictimaiyyətinə mütəmadi məlumatlar verirlər. Paytaxtın Xətai rayonunda Xocalı qurbanlarının xatirəsini əbədiləşdirən abidənin ucaldılması da faciə zamanı həlak olmuş soydaşlarımızın ruhuna hörmət və ehtiramı özündə əks etdirir. Biz həm də inanırıq ki, xalqımız başda Azərbaycan Prezidenti möhtərəm cənab İlham Əliyev olmaqla Xocalı faciəsini törətmiş erməni vandalistlərinin və onların havadarlarının beynəlxalq hüququn norma və prinsipləri əsasında layiqincə cəzalandırılmasına nail olacaqdır.

Anım mərasimində çıxış edən Fəlsəfə kafedrasının dosenti, beynəlxalq siyasi icmalçı, Əməkdar jurnalist Yasin Qaraməmmədli Xocalı soyqırımının dünya miqyasında tanıdılması istiqamətində ölkə rəhbərliyinin apardığı uzaqgörən siyasətdən danışmış, beynəlxalq təşkilatların və dünyanın aparıcı dövlətlərinin Xocalı soyqırımına ikili standartlardan yanaşmalarından dərin təəssüf hissi keçirdiyini bildirmişdir. O, eyni zamanda son 11 ildə Azərbaycanın iqtisadi cəhətdən dinamik inkişaf etməsini, beynəlxalq siyasi nüfuzunun yüksəlməsini və ölkə rəhbərliyinin iradəsi sayəsində xarici siyasət sahəsində həyata keçirilən hücum taktikasının uğurlu nəticələr verdiyini xüsusi qeyd etmişdir. Dosent Y.Qaraməmmədlinin çıxışında həmçinin müasir dünyamızın siyasi reallıqları geniş əks olunmuşdur.

Tədbirdə çıxış edən ADPU-nun dosenti, şair Oqtay Rza Xocalı soyqırımına həsr etdiyi şeirini oxumuşdur. Tələbə Gənclər Təşkilatının sədri Sahil Qələndərov isə universitetin tələbə-gənclərinin Xocalı soyqırımının iyirmi ikinci ildönümü ərəfəsində həyata keçirdiyi tədbirlərdən danışmış və bu tədbirlərin gələcəkdə də davam etdiriləcəyini bildirmişdir.

**Mənsur İBRAHİMLİ,**
**Mətbuat və informasiya şöbəsinin müdiri, Azərbaycan Jurnalistlər Birliyinin üzvü**

## XOCALI

Xocalı, Vətənim! Bəxtimə düşən,
Ən böyük qubarım, həsrətim mənim.
Qəlbimdə göynəyən sağalmaz yaram,
Ruhumda inləyən fəryadım mənim.

Sən cənnət yurdumsan dağlar qoynunda,
İyirmi iki ildir ki, sənsiz qalmışam.
Mənfur düşmən gəzir mənim yurdumda,
Həsrətdən, hicrandan gül tək solmuşam.

O dəhşətli gecə, sənin torpağın,
İgid oğulların məzarı oldu.
Mənfur düşmənlərin azğınlığının,
Neçə-neçə körpə qurbanı oldu.

Altı yüz on üç insanın qanını tökən,
Min iki yüz yetmiş beş nəfəri əsir götürən,
Yüz əlli nəfəri itkin düşürən,
Mənfur düşmənlərə lənət! Min lənət!

Bir gün qurulacaq zəfər məqamı,
Düşmənin bağrına daş yağacaqdır!
Şəhidlər ölməyir, cənnət qazanır,
Düşmənlər cəhənnəm oduyla yanacaqdır!



**Əhəd CƏBRAYILZADƏ,**
**Bakı Özəl Türk Liseyinin VIII sinif şagirdi**

***Redaksiyadan:** Əhəd Cəbrayılzadənin bu şeiri ANS Şirkətlər Qrupunun Xocalı soyqırımı ilə əlaqədar keçirdiyi müsabiqədə I yerə layiq görülmüşdür.*

> **“1992-ci ilin fevralında törədilmiş Xocalı faciəsi insanlığa qarşı çevrilmiş, öz qəddarlığı və amansızlığına görə misli görünməmiş soyqırımı aktı kimi tarixdə qalacaqdır”.**
>
> **Heydər ƏLİYEV, ümummilli lider**

# Öncə Vətəndir!

## Pedaqogika və psixologiya fakültəsinin Xocalı faciəsinin iyirmi ikinci ildönümünə həsr etdiyi tədbir belə adlanırdı

**Fevral ayının 24-də keçirilən tədbiri IV kurs tələbəsi Vüşalə Hüseynova açmışdır. Öncə Vətən torpaqları uğrunda həlak olmuş şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilmişdir.**

Tədbirdə çıxış edən Pedaqogika və psixologiya fakültəsinin dekanı, dosent Şəhla Əliyeva Xocalı faciəsini və eləcə də digər rayonlarımızın işğalını “bütün XX əsr boyunca ermənilərin azərbaycanlılara qarşı apardıqları torpaq iddialarının sonu, nəticəsi” adlandırmış, “Xocalı faciəsinin Xirosima, Naqasaki və Xatın faciələrinə bərabər tutulduğunu” demiş, uşaq yaşlarını xatırlamışdır: “Mənim getdiyim uşaq bağçası erməni uşaq bağçası ilə üzbəüz idi. Bu uşaqlar bizi bir-birinə göstərib deyirdilər: “Onlar pisdirlər, türkdürlər, onlarla söhbət etməyin”. Bu, o deməkdir ki, - söyləmişdir Ş.Əliyeva, - ermənilər hələ uşaq yaşlarından öz övladlarında azərbaycanlılara nifrət hissi aşılayırlar.

“Unutqanlıq bizim təbiətimizdədir, odur ki, erməni qaniçənlərinin xalqımıza qarşı törətdiyi soyqırımı faktlarını övladlarımıza olduğu kimi danışıb dərk etdirməli, ermənilərin xalqımızın əbədi düşməni olduğunu böyüməkdə olan hər kəsin qanına, ruhuna hopdurmalıyıq. Yalnız bu yolla unutqanlıqdan yaxa qurtara bilərik” deyən dosent Ş.Əliyeva 1992-ci ilin fevralın sonlarının, xüsusilə sonuncu ongünlüyündə Xocalının ağır və məşəqqətli yaşam tərzi, fevralın 25-dən 26-na keçən gecə və ondan daha bir neçə gün sonra dinc, əliyalın Xocalı sakinlərinin başına gətirilənlər barədə tələbələri məlumatlandırdı. Dedi ki, Xocalının başına gətirilənlər - 1988-ci ildən başlamış Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi dövründə baş vermiş, tarixdə analoqu olmayan çox az hadisələrdəndir. 1992-ci ilin bu qanlı hadisəsi baş verənə qədər Xocalıda 7 min yerli sakin, eyni zamanda məlum hadisələrə görə Ermənistandan və qonşu Xankəndidən didərgin salınmış azərbaycanlılar, həmçinin Fərqanə hadisələrindən sonra Xocalıda məskunlaşmış mexseti türkləri də yaşayırdılar.



Fevralın 25-dən 26-na keçən gecə Xocalıda törədilmiş qanlı hadisə 613 nəfərin ölümü, 487 nəfərin şikəstlik tapması ilə nəticələnmişdir ki, öldürülənlərin 106 nəfəri qadın, 63 nəfəri uşaq, 70 nəfəri qoca insanlar olmuşlar. Erməni qaniçənlərinin bu vəhşiliyi 8 ailənin bütövlükdə məhvi, 24 uşağın hər iki valideynini, 130 uşağın isə valideynlərindən birini itirməsi ilə tarixin yaddaşında qalmışdır. Bu cinayətdə 56 nəfər xüsusi qəddarlıq və amansızlıqla qətlə yetirilmişdir, başqa sözlə, onlar diri-diri yandırılmış, başları kəsilmiş, üzlərinin dərisi soyulmuş, körpə uşaqların gözləri çıxarılmış, hamilə qadınların süngü ilə qarınları yarılmışdır. Ermənilər hətta meyitləri də təhqir etmişlər.



Dekan Ş.Əliyeva çıxışının bu yerində dedi: “Bugünkü tarix hər bir azərbaycanlı kimi mənim üçün də çox ağırdır. Xocalı faciəsi 1988-ci ildən sonra ermənilərin Azərbaycanda törətdikləri bütün qanlı hadisələr arasında mənə ən ağır, ən sarsıdıcı təsir edən bir hadisədir”.

Daha sonra dosent Ş.Əliyeva ulu öndər Heydər Əliyevin Xocalı faciəsinin soyqırımı aktı kimi dünyada tanıdılması istiqamətində yorulub-usanmadan fəaliyyət göstərməsindən, “Xocalı soyqırımı qurbanlarının xatirəsinə sükut dəqiqəsi edilməsi haqqında» imzaladığı 25 fevral 1997-ci il tarixli sərəncamdan, həmçinin Milli Məclisin “Xocalı Soyqırımı Günü haqqında” qərar qəbul etməsindən bəhs etmişdir.

Xocalı faciəsində doğmalarını itirmiş, başı bəlalar çəkmiş Xocalı sakinləri ilə şəxsən görüşmüş fakültənin dekan müavini, dosent Allahyar İmanovun, Yaş və pedaqoji psixologiya kafedrasının müdiri, professor Ərəstun Baxşəliyevin çıxışları da tələbələrdə vətənpərvərlik və vətəndaşlıq duyğuları formalaşdırılması kimi bir işdə xüsusi əhəmiyyətə malikdir.

Dosent A.İmanov çıxışında demişdir: “Biz azərbaycanlılar unutqan xalqıq. Elə tez unutduğumuza görə də başımıza bu işlər gəlir. Yetişməkdə olan nəsilə sözümüz, təbliğatımız bu olmalıdır ki, biz düşmənimizi tanımalıyıq”.

Professor Ə.Baxşəliyevin tələbə-gənclərə müraciətlə söylədiklərindən: “Ermənilərin bizə qarşı bu qisası - bu günün deyil, uzun illərin məqsədyönlü siyasətinin nəticəsidir. Gələcək ailənizdə dünyaya gələn övladlarınıza bunları başa salmalısınız. Bu təbliğat ailədən başlamalıdır. İnanıram ki, Azərbaycan torpaqlarının azadlığı uğrunda tökülən qanların qisası alınacaq”.

Sonda tələbələrdən İnarə Babayeva, Rəna Əlizadə, Salman Mirzəzadə, Türkanə Həmidova və Nərmin Səfərovanın ifasında Xocalı faciəsinə həsr olunmuş şeirlər oxundu, video-çarx nümayiş etdirildi.

**Ayətxan ZİYATXANOĞLU**



# Xalqın, Vətənin taleyi hər bir insanın taleyinə çevrilməlidir!

## Ana Vətən Partiyası Gənclər Təşkilatının universitetimizin tələbə-gəncləri ilə keçirdiyi görüşdə başlıca leytmotiv bu idi

**Fevral ayının 25-də keçirilmiş görüşü Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri Vurğun Məmmədov açdı. Öncə ulu öndər Heydər Əliyevin və Xocalı soyqırımında şəhid olmuş Vətən övladlarının xatirəsi bir dəqiqəlik sükutla yad edildi.**

Keçirilən tədbirin məqsədinin müstəqil Azərbaycan dövlətinin banisi və qurucusu, ulu öndər Heydər Əliyevin siyasi irsinin öyrənilməsi və təbliği olduğu barədə toplantı iştirakçılarını məlumatlandıran Vurğun Məmmədov çıxış üçün sözü Ana Vətən Partiyasının (AVP) Gənclər Təşkilatının sədri Tural Məmmədova verdi.

Bu gün ulu öndər Heydər Əliyevin dövlətçilik ideologiyasını əsas tutaraq Azərbaycan dövlətinin daha da güclənməsi və xalqımızın rifah halının yüksəlməsində Azərbaycan gəncliyinin rolu nədən ibarətdir? Görüşü səciyyələndirən bu məziyyətlərdən bəhs edən T.Məmmədov əsl vətəndaş, vətənpərvər olmaq üçün dahi şəxsiyyət Heydər Əliyevin siyasi irsindən bəhrələnməyin vacibliyindən söz açdı. Ümummilli Liderin Azərbaycançılıq ideologiyasından, xalqımızın müstəqillik arzularının həyata keçməsi yolunda bu qüdrətli şəxsiyyətin siyasi arenada olduğu bir qərinədən artıq dövr ərzində keçdiyi yenilməz liderlik yolundan bəhs etdi. Qeyd etdi ki, Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi 20, yaxud 30 illik bir zamanın deyil, bütöv XX əsr boyunca Azərbaycan torpaqlarının işğalına istiqamətlənmiş məkrli erməni siyasətinin davamıdır. Hansı ki, bu məkrli siyasətin nəticəsi olaraq əzəli Azərbaycan torpaqlarında yox yerdən Ermənistan dövləti yaradılıb, ötən əsrin sonuncu onilliyində isə respublikamızın Dağlıq Qarabağ Muxtar Vilayəti ərazisi və daha neçə Azərbaycan rayonu erməni təcavüzkarlarının işğalı altına düşüb. XX əsrin sonuncu onilliyində bir daha genişlənən bu işğalçı siyasət bütövlükdə Azərbaycan dövlətinin, Azərbaycan dövlətçiliyinin varlığını təhlükə altında qoydu. Xalqımızı başının üzərini almış bu kabusdan dünya siyasətində artıq öz sözünü deməyə qadir, öz iradəsini yetərincə diktə etmək iqtidarına malik ulu öndər Heydər Əliyev qurtardı.



AVP Gənclər Təşkilatının sədri Tural Məmmədovun bütün çıxışı boyunca vurğuladığı məntiq bu oldu ki, ulu öndər Heydər Əliyev tərəfindən xalqımıza bəxş edilmiş müstəqilliyi, firavan, xoşbəxt həyatı qorumaq hər bir azərbaycanlının, Azərbaycan gəncinin müqəddəs borcudur. Bu borcu yerinə yetirməyə qadir qüvvə olmaq üçün biz gənclik olaraq biz ulu öndər Heydər Əliyevin siyasi irsini dərindən öyrənməli və təbliğ etməliyik. Biz eyni zamanda Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin ətrafında sıx birləşməli, onun çoxşaxəli dövlətçilik fəaliyyətinə hərtərəfli dəstək verməliyik.

Tədbirdə AVP-nin Gənclər Təşkilatının sədrinin siyasi məsələlər üzrə müavini Mikayıl İbrahimov, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Zülfiyyə Mustafayeva da iştirak etmişlər.

***

Sonda universitetimizin gənclərini maraqlandıran suallar cavablandırıldı.

**A.İSGƏNDƏROV**

# Xocalı soyqırımı - XX əsrin faciəsi

**Tarix fakültəsi tələbələrinin pedaqoji təcrübə zamanı Mehdi Hüseynzadə adına 19 nömrəli tam orta məktəbdə keçirdikləri tədbir**

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) tələbələri pedaqoji təcrübə müddətində dərslərdə yaxından iştirak etməklə yanaşı, pedaqoji təcrübədə olduqları orta məktəblərin ictimai-mədəni həyatında da fəal iştirak edirlər. Bu müsbət hal universitetimizin digər fakültələri kimi, Tarix fakültəsi tələbələrinin timsalında da özünü xüsusi büruzə verir.

Yanvar ayının 17-də pedaqoji təcrübəyə başlamağımızla əlaqədar olaraq Tarix fakültəsinin qiyabi şöbəsinin IV və V kurslarında təhsil alan tələbələr ilə konfrans keçirildi. Universitet üzrə pedaqoji təcrübənin rəhbəri, dosent Xankişi Məmmədov, Tarix fakültəsinin dekan müavinləri, dosent Nazir Əsədov və baş müəllim Habil Həsənov, həmçinin Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının müdiri, dosent Rəcəb Əliyev, həmin kafedranın professoru, metodist Mais Əmrahov, kafedranın dosenti, metodist, fakültə üzrə pedaqoji təcrübənin rəhbəri Tahir İsgəndərov, baş müəllim, metodist Təranə İsayeva, baş müəllim, metodist Ofelya Sadıqzadə, müəllim, metodist İsa Quliyev və müəllim, metodist Taleh Cəfərovun iştirakı ilə pedaqoji təcrübədə iştirak edəcək tələbələr məktəblər üzrə bölüşdürüldülər və biz pedaqoji təcrübəyə başladıq.



Qeyd edim ki, biz gündəlik dərslərdə iştirak etməklə bərabər, məktəbin ictimai işlərində də fəal olmağa çalışırdıq. Belə ki, fevral ayının 14-də pedaqoji təcrübə keçdiyimiz Bakı şəhərinin Nəsimi rayonundakı Mehdi Hüseynzadə adına 19 nömrəli tam orta məktəbdə məktəb kollektivinin yaxından köməyi ilə qrup yoldaşlarım Türkanə Novruzova, Vüsal Məmmədov, Şəfiqə Yardımlı və Nuriyyə Rəhimova ilə birlikdə Xocalı soyqırımının iyirmi ikinci ildönümünə həsr edilmiş tədbir təşkil etdik. Məlumat üçün bildirim ki, Pedaqoji Universitetin tələbələri uzun müddətdir ki, təcrübəli təhsil işçisi Məmməd Qəmbərovun direktor olduğu Mehdi Hüseynzadə adına 19 nömrəli tam orta məktəbdə pedaqoji təcrübə keçirlər. Tələbələrimiz pedaqoji təcrübə zamanı daim məktəb rəhbərliyinin və pedaqoji kollektivin qayğı və diqqətini hiss edirlər. Məktəbin müəllimləri öz bilik və bacarıqlarını, təcrübələrini tələbələrimizə həvəslə öyrədirdilər. Elə biz də pedaqoji təcrübədə olduğumuz müddətdə bu qayğı və diqqəti gördük.

Məktəbin 6a sinfində keçirdiyimiz tədbir təcrübəçi tələbələrin və şagirdlərin Dövlət Himnimizi oxumaları ilə başladı. Xocalı soyqırımı zamanı həlak olmuş soydaşlarımızın xatirələri bir dəqiqəlik sükutla yad edildi. Sonra tədbiri giriş sözü ilə Tarix fakültəsinin qiyabi şöbəsinin IV kursunun 403-cü qrup tələbəsi Gülnar Süleymanova açaraq 1992-ci il fevral ayının 25-dən 26-na keçən gecə Xocalı soyqırımının baş verdiyi dövrün ictimai-siyasi vəziyyəti və faciənin nəticələri haqqında şagirdlərə ətraflı məlumat verdi. Təcrübəçi tələbələrdən Türkanə Novruzova, Vüsal Məmmədov çıxış edərək Xocalı faciəsi zamanı ermənilərin keçmiş Sovet Ordusunun Xankəndidə yerləşən 366-cı motoatıcı alayın yaxından iştirakı ilə azərbaycanlılara qarşı törətdikləri dəhşətli soyqırımı haqqında konkret faktlar əsasında geniş danışdılar.





Eyni zamanda təcrübəçi tələbələrdən Gülnar Süleymanova və Vüsal Məmmədov tədbirdə Xocalı soyqırımına verilən siyasi-hüquqi qiymətə də xüsusi toxundular. Bildirdilər ki, Xocalı soyqırımının beynəlxalq ictimaiyyətə çatdırılması ilə bağlı əməli tədbirlər yalnız ümummilli liderimiz Heydər Əliyevin xalqımızın çox böyük istəyi və inadlı tələbi ilə Azərbaycanda yenidən ali dövlət hakimiyyətinə qayıtmasından sonra həyata keçirildi. Məhz ulu öndərimiz Heydər Əliyev respublikamızda yenidən hakimiyyətə qayıtdıqdan sonra işğalçı Ermənistanın Azərbaycana qarşı həyata keçirdiyi soyqırımı və terror siyasətinin mahiyyətini özündə dolğun əks etdirən faktların dünya ictimaiyyətinə çatdırılmasını müstəqil dövlətimizin xarici siyasətinin ən mühüm vəzifələrindən biri kimi müəyyənləşdirdi və bu vacib istiqamətdə səmərəli əməli tədbirlər həyata keçirdi. Bu məqsədlə atılan addımlardan biri isə Xocalı faciəsinə siyasi-hüquqi qiymətin verilməsi oldu. Xalqımızın dahi lideri Heydər Əliyevin təşəbbüsü ilə 1994-cü il fevralın 24-də Milli Məclisdə «Xocalı Soyqırımı Günü haqqında» qərar qəbul edildi, BMT-yə və dünyanın aparıcı dövlətlərinə bu faciənin mahiyyətini açıqlayan və beynəlxalq ictimaiyyəti erməni terrorçuluğuna qarşı təsirli tədbirlər görməyə çağıran müraciət ünvanlandı. Ulu öndərimiz Heydər Əliyev «Xocalı soyqırımı qurbanlarının xatirəsinə sükut dəqiqəsi edilməsi haqqında» 25 fevral 1997-ci il tarixli müvafiq sərəncam imzalamışdır ki, bu sərəncama əsasən hər il fevralın 26-sı saat 17:00-da Azərbaycan Respublikasının ərazisində Xocalı soyqırımı qurbanlarının xatirəsinə ehtiram əlaməti olaraq sükut dəqiqəsi elan edilir.

Onu da qeyd edək ki, hər il olduğu kimi, bu il də həm ölkəmizdə, həm də dünyanın bir çox xarici ölkələrində Xocalı soyqırımının ildönümü ilə əlaqədar müxtəlif tədbirlər keçirilir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev bu il fevral ayının 13-də "Xocalıya ədalət" kampaniyasının keçirilməsi ilə bağlı tədbirlər haqqında Sərəncam imzalamışdır. Xocalı faciəsi zamanı həlak olmuş soydaşlarımızın ailələri hər bir zaman Azərbaycan Prezidenti cənab İlham Əliyevin diqqət mərkəzindədir. Respublikamızın 48 rayonunda məskunlaşmış xocalılara dövlət səviyyəsində hər cür qayğı və köməklik göstərilir. Xatırladaq ki, ölkə Prezidenti İlham Əliyev 2012-ci il yanvar ayının 17-də Xocalı soyqırımının iyirminci ildönümü haqqında sərəncam imzaladı və həmin sərəncama uyğun olaraq Xocalı soyqırımı ölkəmizdə dövlət səviyyəsində keçirildi. 2012-ci il fevral ayının 26-da xalqımız dövlət başçımız İlham Əliyevin rəhbərliyi ilə Bakıda Xocalı faciəsinin iyirminci ildönümü ilə əlaqədar möhtəşəm bir yürüş keçirdi ki, bu da dünya ictimaiyyətinin diqqətinin yenidən Xocalı soyqırımına yönəltdi.

Ölkənin birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, Yeni Azərbaycan Partiyasının Sədr müavini, millət vəkili Mehriban Əliyeva bütövlükdə Azərbaycan həqiqətləri, o cümlədən Xocalı faciəsi haqqında beynəlxalq ictimaiyyətin lazımi səviyyədə məlumatlandırılması üçün səmərəli əməli fəaliyyət göstərir. Heydər Əliyev Fondunun vitse-prezidenti Leyla xanım Əliyevanın təşəbbüsü ilə artıq bir neçə ildir ki, keçirilən "Xocalıya ədalət" beynəlxalq məlumatlandırma kampaniyası Xocalı soyqırımı haqqında dünya ictimaiyyətinə düzgün və ətraflı məlumatların verilməsi, erməni terrorizminin ifşa edilməsi baxımından mühüm əhəmiyyət kəsb edir.

Bütün bunlarla yanaşı, Milli Məclis də mütəmadi olaraq Xocalı soyqırımı ilə əlaqədar xüsusi iclaslar keçirir və müvafiq bəyanatlar qəbul edir. Həmin bəyanatlarda birmənalı şəkildə bildirilir ki, müstəqil Azərbaycan dövləti mövcud imkanlardan maksimum yararlanaraq, ərazi bütövlüyümüzü təmin edəcək, Xocalı faciəsinin əsl beynəlxalq siyasi-hüquqi qiymət almasına və erməni cəlladlarının cəzalandırılmasına nail olacaqdır. Eyni zamanda Azərbaycan Respublikasının İnsan Hüquqları üzrə Müvəkkili (Ombudsman) hər il Xocalı soyqırımı ilə bağlı dünya ictimaiyyətinə müraciətlər ünvanlayır. Həmçinin Diaspora İş üzrə Dövlət Komitəsi və ölkəmizin vətəndaş cəmiyyəti institutlarının təmsilçiləri-qeyri-hökumət təşkilatlarının, ictimai birliklərin nümayəndələri Xocalı faciəsi ilə bağlı dünya ictimaiyyətinə mütəmadi məlumatlar verirlər. Paytaxtın Xətai rayonunda Xocalı qurbanlarının xatirəsini əbədiləşdirən abidənin ucaldılması da faciə zamanı həlak olmuş soydaşlarımızın ruhuna hörmət və ehtiramı özündə əks etdirir.

Tədbir 6a sinif şagirdlərinin Xocalı soyqırımına həsr etdikləri ədəbi-bədii kompozisiya ilə yekunlaşdı.

**Gülnar SÜLEYMANOVA,**
**Tarix fakültəsinin qiyabi şöbəsinin IV kursunun 403-cü qrup tələbəsi**

# İstedadlı pedaqoq-alimin uğuru



Yüksək intellekt səviyyəsinə malik istedadlı pedaqoq-alim, Azərbaycan Dövlət Pedaqoji Universitetinin Rus dili kafedrasının müdiri, dosent Vəzirova Leyla Orxan qızı 1967-ci ildə Bakı şəhərində görkəmli ədib və ictimai-siyasi xadim Yusif Vəzir Çəmənzəminlinin ailəsində anadan olmuşdur. Orta təhsilini Bakı şəhərində almış, 1989-cu ildə Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) Filologiya fakültəsini bitirmişdir. İlk əmək fəaliyyətinə 1989-cu ildə Azərbaycan Politexnik İnstitutunun (indiki Azərbaycan Texniki Universiteti) Rus dili kafedrasında saathesabı müəllim kimi başlamış, 1990-cı ildən isə əmək fəaliyyətini Azərbaycan Dövlət Pedaqoji İnstitutunda (indiki ADPU) davam etdirmişdir.

Uzun illər bu ali təhsil müəssisəsində pedaqoji fəaliyyət göstərən Leyla Vəzirova universitetin əksər fakültələrində praktiki və müasir rus dili fənlərini yüksək səviyyədə tədris etmişdir. İşlədiyi müddətdə müxtəlif ixtisaslara yiyələnən çoxsaylı tələbələrin hazırlanmasında səmərəli fəaliyyət göstərmiş L.Vəzirova dərs dediyi tələbələrin sevimli müəlliminə çevrilmiş, kollektivdə özünə böyük hörmət və nüfuz qazanmışdır.

L.Vəzirova pedaqoji fəaliyyətlə yanaşı, həm də elmi-tədqiqatla məşğul olmuşdur. O, 2002-ci ildə "Y.V.Çəmənzəminlinin publisistikası" mövzusunda namizədlik dissertasiyasını uğurla müdafiə edərək filologiya elmləri namizədi (indi filologiya üzrə fəlsəfə doktoru) adına layiq görülmüşdür.

2004-cü ildən dosent vəzifəsində əmək fəaliyyətini davam etdirən L.Vəzirova bir sıra elmi əsərlərin-"Y.V.Çəmənzəminlinin publisistikası", "Obosoblennıe çlenı predlojeniə v sovremennom russkom əzıke", "Praktiçeskiy kurs russkoqo əzıka", "Proqramma po praktiçeskomu kursu russkoqo əzıka-dlə bakalavrov pedaqoqiçeskix vuzov i universitetov" əsərlərinin, ümumilikdə isə 47 məqalənin müəllifi və bir neçə kitabın rəyçisidir. Bu məqalələr respublikamızda və xaricdə bir sıra nüfuzlu elmi və mətbu nəşrlərdə çap olunmuşdur. L.Vəzirova bu gün də yeni elmi məqalələr çap etdirir.

Qeyd edək ki, onun elmi-tədqiqatlarının əsas istiqaməti və problemi rus dilçiliyi məsələlərindən ibarətdir. O, müxtəlif elmi konfranslarda və digər elmi tədbirlərdə iştirak etmiş, sanballı çıxışları ilə diqqəti cəlb etmişdir.

İstedadlı pedaqoq-alim L.Vəzirova öz elmi fəaliyyətini davam etdirərək "Sopostavitelğnıy analiz russkoy i azərbaydjanskoy sinonimiki. Raspredelenie konnotaüiii" mövzusunda doktorluq dissertasiyasını müdafiə etmişdir.

Bu yaxınlarda isə dosent L.Vəzirovanın doktorluq dissertasiyası Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyası tərəfindən təsdiq edilmiş və ona filologiya üzrə elmlər doktoru elmi dərəcəsi verilmişdir.

Biz də bu böyük uğuru münasibətilə Leyla müəlliməni ürəkdən təbrik edir, ona möhkəm cansağlığı və elmi-pedaqoji fəaliyyətində yeni-yeni uğurlar arzulayırıq!

**Mətbuat və informasiya şöbəsi**

# Təhsil problemləri müzakirə edilmişdir

Türkiyənin Aband platformu bu il fevral ayının 22-də İstanbul şəhərində dünyanın bir çox ölkələrində fəaliyyət göstərən təhsil işçilərini bir araya gətirdi. Qeyd edək ki, 1998-ci ildən fəaliyyət göstərən Aband toplantısı indiyə qədər 31 dəfə keçirilmişdir. Bu toplantılarda Türkiyənin maraq dairəsində olan problemlər müzakirə edilmişdir. Bu dəfə müzakirə edilən problem isə "Türkiyənin təhsil sınağı: ölkələrarası təcrübələr işığında təhsil siyasəti" idi. Aband platformu iştirakçıların sərbəst müzakirəsi əsasında keçirilmişdir.

ADPU-nun Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının müdiri, professor Zahid Xəlil və Kompyuter Mərkəzinin rəhbəri, dosent İlham Əhmədov da həmin müzakirələrdə fəal iştirak etmişlər.

**"Gənc müəllim"**

# Məktəb riyaziyyat təhsilinə vektorun daxil edilməsi məsələsinə dair



**Azadxan ADIGÖZƏLOV,**
**Riyaziyyat və onun tədrisi metodikası kafedrasının müdiri, Beynəlxalq Təbiət Elmləri Akademiyasının həqiqi üzvü, professor**

**Yaxın keçmişdə olduğu kimi, son zamanlar da məktəb riyaziyyat kursunda vektorların öyrənilməsi problemi yenidən fəal şəkildə müzakirə olunur. Diskussiya kifayət qədər geniş xarakter almışdır. Bu zaman, əlbəttə, başlıca diqqət məktəb həndəsə kursunda vektora necə tərif vermək məsələsinə yönəlmişdir. Bu məsələnin tarixinin müəllimlər tərəfindən dərk edilməsi hazırda vektorun məktəbdə öyrənilməsi ilə əlaqədar müzakirə olunan metodik problemin həllinə kömək edə bilər.**

Bu iş yalnız bizim məktəblər üçün deyil, həm də xarici ölkə məktəbləri üçün səciyyəvi olmuşdur. Belə ki, ABŞ məktəblərinin yuxarı sinifləri üçün kifayət qədər geniş yayılmış E.E.Maunz, F.L.Daunsun (1972-ci ildə rus dilində çap olunmuşdur) həndəsə dərsliyində vektor tamamilə nəzərdən keçirilməmişdir. Qeyd etmək lazımdır ki, həmin dərsliyin ikinci nəşrində artıq vektorlar haqqında məlumatlar minimal həcmdə olsa da dərsliyə daxil edilmişdir.

Tanınmış pedaqoq S.Xoup tərəfindən əsasən qrammatik məktəblər (11 yaşından 16 yaşa qədər təlim alan uşaqlar üçün) yazılmış geniş miqyasda tanınmış ingilis eksperimental «Riyaziyyat» dərsliyində (1971-ci ildə rus dilinə çevrilmişdir) vektor anlayışı tədricən formalaşır; vektora ədədi qiyməti və istiqaməti olan kəmiyyət kimi tərif verilir, vektorun xassələri haqqındakı teoremlər isbat edilmir.

E.Kastelnuovo tərəfindən İtaliya məktəbləri üçün (ilk nəşrləri 1974-cü illərdə çıxmışdır) yazılmış «Ədədlər», «Həndəsə» dərsliklərində vektorlardan istifadə olunmamışdır.

Yapon məktəblərində vektorlar cəbri haqqında ilkin məlumatlar uşaqlara on birinci təlim ilində verilir, vektorların skalyar hasili isə on ikinci təlim ilində verilir.

Fransız məktəblərinin riyaziyyat proqramları 1965-ci ildən başlayaraq şagirdlərin vektor anlayışı, vektorların toplanması, çıxılması, vektorun ədədə vurulması, vektorların toplanması, çıxılması, vektorların skalyar hasili, xətti tənliklərin vektor şərhi, vektorun həndəsə məsələlərinə tətbiqi ilə tanışlığını nəzərdə tutur. Yuxarı siniflərdə vektor analizinin elementləri daxil edilir. Müəllimlər üçün fransız riyaziyyat ədəbiyyatı arasında İ.Dyedonne, Q.Şoke, L.Feliks və digər görkəmli riyaziyyatçıların vektorlara və onların tətbiqlərinə ciddi diqqət yetirildiyi gözəl kitabları vardır. Lakin Fransanın məktəb təcrübəsinə bu kitablar əhəmiyyətli təsir göstərməmişdir. Hər halda vektor metodunun daxil edilməsinə aid olan həmin müəlliflərin ideyalarının reallaşdığı məktəb dərslikləri bizə məlum deyildir.

Belçikalı riyaziyyatçı və pedaqoq İ.Papinin geniş yayılmış «Müasir riyaziyyat» eksperimental kursunda məktəb riyaziyyat kursu ardıcıl olaraq İ.Dyedonnenin sxemi üzrə şərh olunmuş, o cümlədən vektorların izahında ən modernist yanaşma tətbiq olunmuşdur (60-cı illərdə onun 12 cildi çap olunmuşdur).

Sosialist ölkələrinin məktəb proqramlarına vektorlar çox da keçmişdə deyil, 70-ci illərdə daxil edilmişdir. Tanınmış pedaqoq-riyaziyyatçı Z.Kriqovskaya müəllimlər üçün nəzərdə tutulmuş «Həndəsə» vəsaitində yalnız liseyin planimetriya kursunun birinci hissəsinin sonunda vektorları öyrənməyi tövsiyə edir.

60-cı illərin əvvəllərində keçmiş Sovetlər Birliyində məktəb riyaziyyat dərsliklərini müasir elmin səviyyəsinə uyğunlaşdırmağa cəhdlər göstərməyə başlanılmışdır. İnamla təsdiq etmək olar ki, bu sonralar A.N.Kolmoqorov və A.İ. Markuşeviçin rəhbərliyi altında həyata keçirilməyə başlayan bütün riyazi təhsildə aparılacaq islahatın təməli olmuşdur.

1963-cü ildə V.Q.Boltyanski və İ.M.Yaqlom IX siniflər üçün yeni həndəsə dərsliyi yazdılar. Bu dərslik yalnız vektorların tipik məktəb mövzularına ardıcıl və metodik baxımdan düşünülmüş şəkildə daxil edilməsi ilə deyil, həm də vektorların tətbiq edildiyi çoxlu və maraqla seçilmiş məsələlərin olması ilə fərqlənirdi. Həmin müəlliflər tərəfindən müəllimlər üçün «Çevrilmələr, vektorlar» kitabı da yazılmışdır. Kitabda metodik göstərişlərlə yanaşı, müəllimin mədəniyyətinin yüksəldilməsinə imkan verən çoxlu material da vardır. İnamla qeyd etmək olar ki, məhz bu dərslik (onunla yanaşı, digər kitablar və məqalələr) həndəsə sahəsində məktəb riyaziyyat təhsili üzrə islahatın aparılmasına hazırlanmışdır. Aydın olmuşdur ki, vektor-məktəb kursunun zəruri anlayışıdır və yaxın gələcəkdə onsuz artıq heç bir dərslik istifadəyə yaramaz.

V.Q.Boltyanski və İ.M.Yaqlomun dərsliyindən cəmisi 2 il istifadə edilmişdir. Bu da təəccüblü deyildir. Belə ki, bu kitab pedaqoji etirazlar və ənənələrin hakim olduğu dövrdə müəllimlər arasında geniş yayılmamışdı. IX sinifə qədər həndəsə əvvəlki «Kiselyov» planı üzrə tədris olunurdu, X sinifdə isə göstərilən dərslik üzrə işlədikdən sonra şagirdlər yenidən stereometriya kursunun öyrənilməsini A.P.Kiselyovun dərsliyi üzrə keçirlər. V.Q.Voltyanski və İ.M.Yaqlomun dərsliyi nə əvvəlki tədris səviyyəsinə hazırlanmış, nə də həndəsənin sonrakı öyrənilməsi tərəfindən dəstəklənməmişdir.

Lakin məktəbdə az müddətdə istifadə edilən və sonradan gözdən itən bu dərslik məktəblərin təlimi və tərbiyəsində böyük rol oynamasa da, bu dərsliyin meydana gəlməsi orta və ali pedaqoji məktəb müəllimləri,metodistlər və alimlər üçün yalnız sadəcə izsiz qalmadı, həm də mühüm nəticələri olmuşdur.

İlk dəfə göstərilmişdir ki,Y.S. Dubovun kitabında olmuş vektor metodun məktəb tədrisi ilə əlaqəsi haqqında ayrı-ayrı qeydlər məktəb həndəsə kursunun vektor əsasında sistematik qurulmasına imkan verir.

Qeyd etmək maraqlıdır ki, V.Q.Voltyanski və İ.M.Yaqlomun 1962-ci ildə çap olunmuş «Orta məktəbin həndəsə kursunda vektorlar» kitabında vektorun bu şərhi onların dərsliyindən əvvəl verilmişdir. Orada qeyd olunmuşdur ki, vektor anlayışının daxil edilməsinin üç müxtəlif yolu vardır. Onlardan birincisi vektora istiqamətlənmiş parça kimi baxılmasıdır. Belə şərh həddən artıq sadələşdirmə, primitivdir. Materialın izahında vektorların «bərabərliyi» anlayışı ilə əlaqədar o daim əlavə düzəliş tələb edir. Üst-üstə düşmə mənada «bərabər» üçbucaqları və konqruyentlik mənada «bərabər» üçbucaqları necə fərqləndirmək lazım gəldiyi hala oxşar vəziyyətlərdə olduğu kimi, ikinci yol-riyaziyyatda və mexanikada geniş tətbiq edilən sərbəst vektor anlayışından istifadə olunmasıdır. Məktəb təcrübəsində bu o deməkdir ki, yalnız bir istiqamətlənmiş parça vektor adlanmır, istiqamətləri eyni və uzunluqları eyni olan tam bir sinif istiqamətlənmiş parçalara vektor deyilir. Belə vektorlar üçün «bərabərlik» üst-üstə düşmə mənasında başa düşülür və vektorlar üzərində bütün əməliyyatlar dəqiq və riyazi baxımdan korrekt müəyyən edilir. Bundan başqa, vektorun belə başa düşülməsi mexanikada tətbiqlər üçün (məsələn,cismin irəliləmə hərəkətinin sürəti) əlverişlidir.

Nəhayət, üçüncü yol-vektoun paralel köçürmə kimi təyin edilməsidir. Riyazi baxımdan bu yol ikinci yola çox yaxındır. Paralel köçürmədə hər bir nöqtəni onun obrazı ilə birləşdirərək biz ikinci mənada başa düşülən vektor alırıq. Lakin vektorun belə başa düşülməsi tədris metodikası baxımından əlverişli deyildir. Paralel köçürmə-həndəsi çevrilmədir (hərəkətdir). Çox vaxt paralel köçürmə və dönmənin kompozisiyası nəzərdən keçirilir. Digər tərəfdən, çox vaxt vektorun müəyyən bir nöqtədən ayrılması, vektorun ədədə vurulması və s. lazım gəlir. Bu zaman həndəsi çevrilmənin ədədə necə vurulması əlverişli deyildir. Bu həndəsi mülahizələr və ənənəvi qəbul edilən terminologiya vektorları və paralel köçürməni fərqləndirməni daha əlverişli edir. Bütün deyilənləri müqayisə edərək belə nəticəyə gəlirik ki, məktəb üçün ikinci yol (vektor-istiqamətlənmiş parçalar sinifidir- «sərbəst vektor») daha münasibdir.

Vektorun məktəb riyaziyyat təhsilinə daxil edilməsi A.N.Kolmoqorovun redaktəsi ilə 6-8-ci siniflər üçün həndəsə dərs vəsaiti ilə əlaqədardır. Bu vəsait keçmiş sovet məkanında riyaziyyat təhsilinin formalaşmasında böyük bir dövrü əhatə edir. Qeyd edək ki, bu dərs vəsaitinin ilk nəşrlərində vektor məktəb riyaziyyatına paralel köçürmə kimi daxil edilmişdir. Belə şərhin qeyri-münasibliyi həm bir sıra riyaziyyatçılar, həm də fiziklər tərəfindən qeyd olunmuş və Elmlər Akademiyasının Riyaziyyat bölməsi tərəfindən ciddi tənqid edilmişdir. Lakin başlıcası bundan ibarətdir ki, bu dərs vəsaiti və ona uyğun hazırlanmış 9-10-cu siniflər üçün Z.A.Skopetsin redaktəsi ilə yazılmış stereometriya vəsaiti üzrə 15 il müddətində aparılmış tədris işində bir daha yoxlanıldı və məktəb həndəsəsi üçün vektor anlayışının həyatiliyi və mühümlüyü təsdiq edildi. Məktəb tədrisində vektor metodun faydası, fizika kursu ilə fənlərarası əlaqənin mühümlüyü, vektorun daxil edilməsilə əldə edilən həndəsə kursunun elmliyi və sadəliyi hamıya aydın oldu.

A.N.Kolmoqorovun redaktəsi ilə yazılmış dərs vəsaiti ilə yanaşı, həndəsədən daha bir sınaq dərsliyi yazılmışdır. Onun müəllifləri (V.Q.Boltyanski, M.B.Voloviç, A.D.Semuşin) vektor mövzularının şərhi və istifadəsində A.N.Kolmoqorovun redaktəsi ilə yazılmış vəsaitindən bir qədər uzağa getmişlər. Bu sınaq dərsliyi digərlərindən vektor metodu ilə həll edilən həndəsə məsələləri miqdarının mühüm dərəcədə çox olması ilə fərqlənir.

Dərsliklərə vektorların skalyar hasilinin daxil edilməsi yalnız həndəsənin bir sıra mövzularının (ən parlaq misal-kosinuslar teoreminin) izahını əhəmiyyətli dərəcədə asanlaşdırmır, həm də riyaziyyatın fizika kursu ilə fənlərarası əlaqələri həyata keçirməyə (bu heç də az əhəmiyyətli deyildir) imkan verir.

Hazırda həndəsə A.V.Poqorelovun dərs vəsaiti üzrə, respublikamızda isə M.C.Mərdanov və başqalarının hazırladığı həndəsə dərsliyi üzrə aparılır. Həmin vəsaitlərdə vektorlar haqqındakı materialın izah edildiyi mövzular saxlanılmışdır. Bunlar bir daha vektorun məktəb riyaziyyat kursu üçün həyatiliyi və mühümlüyünü təsdiq edir.

Məktəb tədrisində vektor metodun inkişaf tarixindən və onun pedaqoji nəzəriyyə və praktika ilə mənimsənilmə mərhələləri haqqında danışaraq, vektorların elementar həndəsədə tətbiqlərinin daha bir istiqaməti-məktəb həndəsə kursunun vektor aksiomatikası əsasında qurulmasından danışmamaq olmaz. İlk dəfə həndəsənin vektor əsasında aksiomatik qurulmasının izahı görkəmli alman riyaziyyatçısı Q.Veyl (1865-1955) tərəfindən göstərilmişdir. Veyl həndəsəni bütün müasir riyaziyyatda və onun tətbiqlərində mühüm rol oynayan vektorlar nəzəriyyəsi əsasında qurmağı təklif etmişdir. Onun izahı yalnız həndəsənin yeni əsaslandırmasını (Hilbertdən fərqli) vermədi, həm də həndəsəni riyazi elmlər sisteminin ümumi sırasına qoymuş, bununla da həndəsənin müasir anlamını və onun gələcəyə məqsədyönlü istiqamətlənməsini hazırlanmış olur. Lakin qeyd etmək lazımdır ki, məktəb dərsliyi üçün yararlı olan və Veylin vektor aksiomatikası əsasında qurulan dərslik hələlik yoxdur.

Nəhayət, qeyd edək ki, vektor metodu bu gün məktəb tədrisinə möhkəm daxil olmuşdur. Bununla da riyaziyyat təhsilinin təkmilləşdirilməsi üzrə çoxillik işlər nəticəsində məktəblərimiz mühüm nailiyyətlər əldə etmişlər.

# ŞƏRQDƏ PARLAMENTLİ İLK DEMOKRATİK DÖVLƏT

**Azərbaycan Xalq Cümhuriyyətinin yaranması çoxəsirlik tarixi olan xalqımızın dövlətçilik tarixində parlaq səhifələrdən biri olub, XX əsrin əvvəllərində dünyada baş verən ictimai-siyasi proseslərin nəticəsi idi. Rusiyada çarizmin devrilməsi, milli-azadlıq hərəkatının güclənməsi Azərbaycan Xalq Cümhuriyyətinin yaranması üçün əlverişli şərait yaratdı. Artıq bu dövrdə Azərbaycanın ictimai-siyasi həyatında fəal iştirak edən qabaqcıl ziyalılarımız millətimizin intellektual potensialını səfərbər edərək, ilk demokratik dövləti yaratmağa başladılar.**

1918-ci ilin may ayının 28-də qəbul edilmiş «İstiqlal Bəyannaməsi» ilə Şərqdə ilk dəfə olaraq Azərbaycanda demokratik respublika idarə üsulu-parlamentli dövlətin yaradıldığı elan edildi. Azərbaycanın dövlətçilik tarixində mühüm əhəmiyyətə malik olan bu sənəd müstəqil Azərbaycan dövlətinin yaradılması ilə yanaşı, onun prioritetlərini və məqsədlərini də dünyaya bəyan etdi.

1918-ci il iyun ayının 17-də Gəncədə öz fəaliyyətini dayandırmış Azərbaycan Milli Şurası həmin il noyabrın 16-da Bakıda yenidən fəaliyyətə başladı. Hökumətin sədri Fətəli xan Xoyski Şuranın iclasında çıxış edərək bildirdi ki, Müəssislər Məclisini çağırmaq üçün hazırlığa vaxt çatmadığından Hökumət bu işi öz öhdəsinə götürməyi Milli Şuradan xahiş edir. Milli Şuranın 1918-ci il noyabrın 19-da Məhəmməd Əmin Rəsulzadənin sədrliyi ilə keçən iclasında "Azərbaycan Məclisi-Məbusanın təsisi haqqında" Qanun layihəsi müzakirə olundu. Milli Şuranın müzakirələr nəticəsində qəbul etdiyi qanunda göstərilirdi ki, hələ 1917-ci ilin sonlarında Cənubi Qafqazın müsəlman partiyalarından ümumi səsvermə yolu ilə Rusiya Məclisi-Müəssisanına seçilmiş 14 nəfər nümayəndənin siyahısı seçkilərdə iştirak etmiş partiyaların qazandıqları səslərə müvafiq olaraq genişləndiriləriək 44 nəfərə çatdırmışdı. Cənubi Qafqaz Mərkəzi Müsəlman Komitəsi Azərbaycanda Məclisi - Müəssisan toplamağın mümkün olmadığını nəzərə alaraq bu məsələnin həllini Zaqafqaziya Seymində Azərbaycanı təmsil etməkdə görmüşdü. Zaqafqaziya Seymi və Zaqafqaziya Cümhuriyyəti Hökuməti öz fəaliyyətinə xitam verdikdə Seymdəki 44 nəfər müsəlman deputat Azərbaycan Milli Şurasının yaradıldığını elan etmiş və Azərbaycanın idarəçiliyini öz üzərinə götürmüşdü.

Milli Şuranın qəbul etdiyi "Azərbaycan Məclisi-Məbusanın (Parlamentinin) təsisi haqqında" Qanunda göstərilirdi ki, Azərbaycan Milli Şurası ölkədə yaşayan bütün millətləri təmsil edir. Digər tərəfdən, müxtəlif siyasi partiyaların nümayəndələri ilə bərabər, Azərbaycan xalqının müxtəlif təbəqələrinin də Parlamentdə təmsil olunmalarına böyük ehtiyac var.

Milli Şura Azərbaycan Parlamentini 120 nəfərdən ibarət formalaşdırmağı qərara aldı. Göstərilən qanuna əsasən Parlamentə Azərbaycan Xalq Cümhuriyyəti ərazisində yaşayan xalqların sayı nəzərə alınaraq azərbaycanlılardan 80 nəfər, ermənilərdən 21 nəfər, ruslardan 10 nəfər, yəhudilərdən 1 nəfər, almanlardan 1 nəfər nümayəndə göndərilməli idi. Milli Şuranın qəbul etdiyi qanunda göstərilirdi ki, azlıq təşkil edən millətlərin bütün nümayəndələri yeni nümayəndələr olacaqdır. Müsəlmanlardan isə 44 nəfər Milli Şura üzvü ümumi səsvermə yolu ilə seçildiklərindən yeni Parlamentin tərkibinə üzv daxil edilirlər. Qalan 36 nəfər isə, əlavə nümayəndələr kimi, Azərbaycanın ayrı-ayrı şəhər və qəzalarından göndəriləcəklər. Qanunda sayları az olduğuna görə nümayəndə seçmək səlahiyyətləri olmayan, lakin Cümhuriyyət ərazisindəki digər azsaylı xalqlar arasında nisbətən çoxluq təşkil edən gürcü və polyak milli komitələrinin hərəsindən 1 nümayəndə göndərmələrinə razılıq verilirdi. Bundan əlavə, parlamentə Bakı Həmkarlar Təşkilatları tərəfindən 3 nəfər, Bakı Neft Sənayeçiləri İttifaqından 2 nəfər nümayəndənin göndərilməsi də nəzərdə tutulurdu. Qanuna qeydlərdə Cümhuriyyət Parlamentində təmsil olunacaq üzvlərin müəyyən edilməsi qaydaları da əksini tapmışdı. Qeydlərə əsasən, Parlamentə daxil olan 44 nəfər Milli Şura üzvündən ölən, istefa verən və ya başqa səbəbdən Parlamentdən çıxan nümayəndənin yerinə onun mənsub olduğu partiyanın digər nümayəndəsi daxil olunurdu. Bələdiyyəsi və milli komitəsi olmayan qəzalardan parlamentə nümayəndə kənd şuralarının göndərdiyi nümayəndələrin ümumi iclasında seçilirdi.

Erməni, rus və azlıqda qalan digər millətlərdən Parlamentə nümayəndələr həmin millətlərin milli şuraları və ya komitələri tərəfindən göndərilirdi.

Şəhər nümayəndələrinin sənədləri şəhərlərin bələdiyyə rəisi, qəzalardan göndərilənlərinki barışıq məhkəmələrinin sədri və ya onun müavini, azlıqda qalan millətlərdən isə onların milli şuralarının sədrləri tərəfindən şəxsən imzalanmış, müvafiq seçki protokolları və imza-möhürlə təsdiq olunmuş mandatla təmin edilməli idi.

Parlamentin çağırılması ilə əlaqədar Azərbaycan Milli Şurası adından onun sədri Məhəmməd Əmin Rəsulzadənin imzası ilə 1918-ci il noyabrın 29-da Azərbaycan və rus dillərində "Bütün Azərbaycan əhalisinə!" müraciətnaməsi dərc olunmuşdu.

1998-ci ildə Azərbaycan Xalq Cümhuriyyətinin 80 illiyinin təntənəli surətdə qeyd edilməsi barədə sərəncam imzalamış ulu öndərimiz Heydər Əliyev bununla Cümhuriyyət məfkurəsinin və tarixinin araşdırılması üçün ciddi hüquqi baza yaratmış oldu. AMEA-nın Tarix İnstitutunda yaradılmış AXC tarixi şöbəsi tərəfindən əhatəli elmi tədqiqatlar aparıldı. Cümhuriyyətin ikicildlik ensiklopediyası hazırlanaraq nəşr olundu. Beynəlxalq və respublika səviyyəli konfranslar keçirildi, sənədli filmlər çəkildi. Ümummilli liderimiz Heydər Əliyev AXC-nin tarixi rolunu yüksək qiymətləndirərək demişdir: «Müsəlman Şərqində ilk demokratik cümhuriyyətin məhz Azərbaycanda yaranması xalqımızın o dövrdə milli müstəqillik, azadlıq duyğuları ilə yaşaması ilə bağlıdır. O, illərdə xalqımızın qabaqcıl şəxsiyyətləri, mütəfəkkir adamları, ziyalıları xalqımızda milli azadlıq, milli müstəqillik duyğularını gücləndirmiş, milli dirçəliş, milli oyanış əhval-ruhiyyəsi yaymış və bunların hamısı məntiqi olaraq Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasına gətirib çıxarmışdır».

2007-ci ilin mayında Bakıda Azərbaycan Xalq Cümhuriyyətin şərəfinə ucaldılan «İstiqlaliyyət» abidəsinin açılışı oldu. Açılış mərasimində Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev iştirak edərək xalqımızın tarixində ilk demokratik dövlətin rolunu yüksək qiymətləndirmişdir. Qranitdən və ağ mərmərdən yonulmuş abidənin üzərinə 1918-ci ilin mayın 28-də Tiflisdə qəbul olunmuş «İstiqlal Bəyannaməsi»nin mətni həm əski, həm də latın qrafikalı Azərbaycan əlifbası ilə həkk olunmuşdur. "İstiqlaliyyət" küçəsində qoyulan bu abidə adları Azərbaycan dövlətçiliyi ilə birgə tarixə düşən istiqlal mücadiləsi iştirakçılarının xatirəsinə ən böyük ehtiramdır.

XX əsrin sonlarında Azərbaycan dövlət müstəqilliyini bərpa etdikdən sonra hər il mayın 28-i ölkəmizdə təntənəli şəkildə qeyd olunur. Keçirilən tədbirlərdə Cümhuriyyət dövrünə bir daha nəzər salınır, onun tariximizdəki yeri və rolu ətraflı təhlil edilir, dövlət quruculuğu təcrübəsi hərtərəfli öyrənilir. Ötən il isə xalqımızın parlaq və şərəfli tarixini əks etdirən Azərbaycan Xalq Cümhuriyyətinin yaradılmasının 95 ili tamam oldu.

Azərbaycan Xalq Cümhuriyyətinin yaranması XIX əsrin sonu və XX əsrin əvvəllərində Azərbaycanın ictimai-siyasi, ədəbi, fəlsəfi mühitində cərəyan edən müsbət hadisələrlə sıx bağlıdır. Bu dövrdə artıq Azərbaycanda böyük bir ziyalı dəstəsi meydana gəlmişdi. Onlar Avropa və dünya mədəniyyəti ilə yaxından tanış idilər, öz intellektual potensiallarından millətin maariflənməsi üçün maksimum istifadə edirdilər.

Cəmi 23 ay yaşamasına baxmayaraq, Cümhuriyyət dövründə həyata keçirilən mühüm tədbirlər müstəqil dövlətçiliyimizin əsaslarının yaradılması baxımından çox böyük əhəmiyyət kəsb edib. Demokratik prinsiplərin bərqərar olması, etnik və dini mənsubiyyətindən asılı olmayaraq, bütün insanlara bərabər hüquqların verilməsi, Azərbaycan dilinin dövlət dili elan edilməsi, nizami milli ordunun yaradılması və görülən digər vacib işlər hökumətin həmin dövrdə apardığı siyasətin miqyasını, mahiyyət və əhəmiyyətini əyani şəkildə səciyyələndirirdi.

Parlamentin açılışı 1918-ci il dekabrın 3-nə təyin olunsa da, 7-də baş tutmuşdur. Həmin gün böyük xeyriyyəçi H.Z.Tağıyevin Nikolayev küçəsindəki (indiki "İstiqlaliyyət" küçəsi) yerləşən keçmiş qız məktəbinin binasında müsəlman Şərqində ilk parlamentin birinci iclası təntənəli şəraitdə açılmışdır. Əlimərdan bəy Topçubaşov Parlamentin sədri, doktor Həsən bəy Ağayev sədrin birinci müavini seçildilər. Ə.Topçubaşov bu vaxt İstanbulda olduğu üçün Parlamentə H.Ağayev sədrlik edirdi. 1919-cu ilin yanvarında Ə.Topçubaşov Paris Sülh Konfransında Azərbaycan nümayəndə heyətinin başçısı təyin olunaraq Parisə gedir. O, 1920-ci ilin yanvarında yenidən Parlament sədri seçilmişdir. Cəmi 17 ay fəaliyyət göstərməsinə baxmayaraq, Azərbaycan Xalq Cümhuriyyətinin Parlamenti demokratik dəyərləri özündə ehtiva edən yüzdən artıq sənəd qəbul etmişdir. Bu Parlament göstərdi ki, Azərbaycan xalqı həqiqətən parlament idarəçiliyi səviyyəsinə yüksəlmişdir. O vaxt Azərbaycan Xalq Cümhuriyyəti bütün müsəlman Şərqində yeganə parlamentli respublika idi. Özünün 17 aylıq fəaliyyəti dövründə Azərbaycan Xalq Cümhuriyyətinin Parlamentinin 145 iclası keçirilmişdir.

Parlamentin ilk tədbirlərindən biri Paris Sülh Konfransına səlahiyyətli nümayəndə heyəti göndərməkdən ibarət idi. Bu nümayəndə heyətinin qarşısında Azərbaycan istiqlaliyyətinin Avropa ölkələri tərəfindən tanıdılması kimi tarixi vəzifə dururdu. Nümayəndə heyətinə Parlamentin sədri və üzvləri Ə.Topçubaşov (bitərəf), M.H.Hacınski (Müsavat), Ə.Ağaoğlu (bitərəf), Ə.Şeyxüslamov (Hümmət), eləcə də müşavirlər M.Məhərrəmov (Sosialist), M.Y.Mirmehdiyev (İttihad), C.Hacıbəyli (Müsavat), əməkdaşlar Ə.Hüseynzadə (bitərəf), V.Malçevski (bitərəf) və başqaları daxil idilər.

Azərbaycan Parlamenti ölkədə müvəqqəti qanunvericilik orqanı hesab edildiyindən bir sıra məsələlər Müəssislər Məclisində həll edilməli və Azərbaycan Xalq Cümhuriyyətinin Konstitusiyası da burada təsdiq olunmalı idi. Müəssislər Məclisinə seçkiləri əsaslarını hazırlamaq üçün Parlamentdə böyük bir komissiya yaradılmışdı. Bu komissiya çoxsaylı olub, bütün fraksiyaların nümayəndəlrindən təşkil olunmuşdur. 1919-cu il iyulun 21-də Müəssislər Məclisinə seçkilər haqqında Əsasnamə qəbul edildi. Əsasnamə 4 fəsil, 116 bənddən ibarət idi. Əsasnaməyə görə, Müəssislər Məclisinə seçkilərdə cinsindən, dinindən, dilindən, milliyyətindən asılı olmayaraq, iyirmi yaşına çatmış bütün Azərbaycan vətəndaşları iştirak edə bilərdilər. Seçkilər bərabər keçirilməli və 120 nəfər üzv seçilməli idi. Siyasi partiyalar və təşkilatların namizəd siyahıları tərtib edilib seçkilərdən ən azı 30 gün qabaq mərkəzi seçki komissiyasına təqdim edilməli idi. Seçkilər 1920-ci il aprelin 20-nə təyin edilmişdi.

1918-1920-ci illərdə mövcud olmuş Azərbaycan Xalq Cümhuriyyətinin varisi olan Azərbaycan Respublikasının Milli Məclisi 1918-ci il may ayının 28-də Milli Şura tərəfindən qəbul edilmiş «İstiqlal Bəyannaməsi»nə və 1991-ci il avqust ayının 30-da qəbul edilmiş «Azərbaycan Respublikasının müstəqilliyinin bərpa edilməsi haqqında Bəyannamə»yə əsaslanaraq 18 oktyabr 1991-ci ildə "Azərbaycan Respublikasının dövlət müstəqilliyi haqqında Konstitusiya Akt"ını qəbul etdi və müstəqil ölkəmizin siyasi, iqtisadi və dövlət quruluşunun əsaslarını təsis etdi.

Bu gün Azərbaycan öz siyasi və iqtisadi qüdrətini daim artırır. Azərbaycan Xalq Cümhuriyyətinin siyasi varisi olan müstəqil Azərbaycan dövləti regionun və dünyanın inkişaf etmiş dövlətlərindən birinə çevrilib.

**Elman MİRZƏYEV,**
**Azərbaycan tarixi kafedrasının baş müəllimi, tarix üzrə fəlsəfə doktoru**

# Xocalı - xalqımızın qan yaddaşı




**Sərt gəldi fevralın 26-sı,**
**Al qana qərq oldu bulaqlarda su.**
**Qəfildən quruldu bu yurdun yası,**
**Bir kəsə çatmadı səsim, Xocalı!**

Xocalıda 1992-ci il fevralın 25-dən 26-na keçən gecə erməni cəlladlarının əli ilə ağlasığmaz vəhşiliklə minə yaxın dinc sakinin həyatına son qoyuldu. Qış gecəsi insanlar qarı gözləyərkən güllə yağdı başlarına... Havada qan qoxusu, hər kəsdə ah-nalə. Fikirlərində tək sual: dünyanın sonu çatıbmı?.. Bura nə olub: insan məzarlığı, yoxsa insanlığın məzarlığı?.. Dinc əhali erməni vəhşilərinin qarşısında aciz qaldı. Vicdanını satanlar Xocalını bir gecədə Yer üzündən silib, külə döndərdilər. O gündən sonra Xocalı adı məhv olunmuş şəhərlərin siyahısına düşdü. O müdhiş gecə dəhşətli ayrılıq, həsrət gətirdi xocalılara. Silahlar təkcə bədənlərini yaralamadı, bütün daxili dünyalarını da parçaladı. Hər birimizin, əsas da o dəhşətin şahidi olanların burnunda həmin qoxu, qulaqlarında həmin inilti səsi, gözlərində vəhşi səhnələr unudulmayacaqdır... Həmin gecə gördükləri qarşısında istədikləri tək şey gözlərinin kor, qulaqlarının kar olması idi. Hər kəs bir şey itirdi həmin gecə: şəhidlər canlarını, sağ qalanlar əzizlərini, əlillər bədənin bir hissəsini, ən əsası isə öz yurd-yuvalarını itirdilər. Hər cür vəhşiliklə üzləşən xalqımızın ən böyük dərdi torpaqlarını itirməsi idi.

Etdikləri vəhşiliklərlə fərəhlənən Zori Balayan öz kitabında törətdikləri Xocalı faicəsindən necə qürur hissi ilə yazmış, bu vəhşilikləri "Ruhumuzun dirçəlişi" adlandırmışdır. Bir insan körpənin dərisini soyaraq həzz ala bilərmi?! Qanla zülm edərək qürurlana bilərmi?! Ananı baladan ayıraraq sevinə bilərmi?! Ruhlarını bu şəkildə "dirçəldənlərdən" başqa nə gözləmək olar ki... Qalx ayağa, Türk oğlu!

**Türksən, eloğlu, sızlamaq yetər,**
**İbrət almalıdır sabah dünəndən.**
**Oyan, qalx ayağa, tez ol səfərbər,**
**Qarşıda düşməndi, arxada Vətən.**

Mən isə fikrimi Roma filosofu Senekanın bu müdrik sözləri ilə tamamlayıram: "Nəfəs alırsansa, deməli, ümid var, nöqtə qoyulduqdan sonra bəlkə demək ümid deyil, çarəsizlikdir". Bəli, biz heç zaman çarəsiz xalq olmamışıq. Bizim ümidimiz sərhədsizdir. Biz rəhm hissi ölmüş ermənilərlə mübarizə apararaq ədaləti bərpa edəcəyik. Şəhidlərimizin ruhları qarşısında baş əyərək onlara Allahdan sonsuz rəhmət diləyirəm!

**Günel İbrahimli,**
**Filologiya fakültəsinin**
**II kursunun**
**203-cü qrup tələbəsi**



# Əməkdaşımız Rüfət Əliyev sertifikata layiq görülüb

"ENOTES" layihəsi çərçivəsində əməkdaş universitetlərin akademik heyəti bu il fevral ayının 15-dən 19-dək Litvanın Kaunas şəhərində keçirilmiş təlimlərdə iştirak etmişdir. Məlumat üçün onu da bildirək ki, Tempus proqramı tərəfindən maliyyələşdirilən və Qafqaz Universitetinin koordinatoru olduğu layihənin əsas məqsədi ECDL milli test mərkəzlərinin əməkdaş universitetlərdə qurulmasını təşkil etməkdir. Layihə vasitəsilə ölkənin alia təhsil müəssisələrində informasiya-kommunikasiya texnologiyaları bacarıqlarının inkişaf etdirilməsi və bununla da milli təhsil sisteminin təkmilləşdirilməsi, təlim-tədris prosesində müasir metodlardan istifadə və informasiya-kommunikasiya texnologiyaları biliklərində beynəlxalq standartların tətbiqi qarşıya qoyulmuşdur

Qeyd edək ki, Litvanın İnformasiya Texnologiyaları İnstitutu tərəfindən təşkil edilən təlimlərdə Azərbaycan Dillər Universiteti, Azərbaycan Dövlət Pedaqoji Universiteti, Qafqaz Universiteti, Azərbaycan Memarlıq və İnşaat Universiteti, Azərbaycan Universiteti, Azərbaycan Turizm İnstitutu, Bakı Biznes Universiteti və Naxçıvan Özəl Universitetinin nümayəndələri iştirak etmişlər.

Seminarlarda ECDL sertifikatlarının ölkədə tətbiqi prosesində promosiya strategiyasının təşkili, Avropanın İnformasiya-Kommunikasiyaları Gündəliyi, sertifikatın lokallaşdırılmasının Litva təcrübəsi, nəşr olunacaq ədəbiyyatla bağlı tələblər, nümunə testləri, həmçinin ECDL milli test mərkəzlərinin Litvanın digər yerli universitetləri ilə əməkdaşlığı müzakirə edilmişdir.

Avropa İttifaqı tərəfindən maliyyələşdirilən Tempus proqramı Təhsil-Mədəniyyət Agentliyi tərəfindən idarə edilir. Proqram tərəfdaş ölkələr - Qərbi Balkanlar, Şərqi Avropa, Mərkəzi Asiya, Şimali Afrika və Orta Şərq ölkələri daxil olmaqla 27 ölkəni əhatə edərək ali təhsilin modernləşdirilməsini qarşısına məqsəd qoyur.

Diqqətinizə onu da çatdıraq ki, bu təlimlərdə ölkəmizi təmsil edən 21 nəfərdən 7-si sertifikata layiq görülmüşdür. ADPU-nun əməkdası Əliyev Rüfət Arzu oğlu da "ECDL Start" sertifikatına layiq görülmüşdür. Azərbaycanın Litvadakı fövqəladə və səlahiyyətli səfiri cənab Həsən Məmmədzadə bu sertifikatı əməkdaşımız Rüfət Əliyevə təqdim etmişdir.

Biz də Rüfət Əliyevi bu uğuru münasibətilə təbrik edir, ona yeni uğurlar arzulayırıq.

**Könül MƏMMÇDOVA,**
**Tarix fakültəsinin**
**II kursunun**
**203-cü qrup tələbəsi**

# BƏDƏN TƏRBİYƏSİ VƏ İDMANIN İNSANIN SAĞLAMLIQ VƏ GÜMRAHLIĞINDA ROLU



**Bir əsr insan ömrü üçün son hədd deyil, yüz ildən də artıq yaşamaq olar. Bu, təkcə dağlıq rayonlarda deyil, hər yerdə mümkündür. Ömrün uzadılması problemləri üzərində gerentoloq alimlərin bütün bir ordusu işləyir. Ancaq söhbət təkcə ömrü uzatmaqdan getmir, burada söhbət gənclik dövrünü necə uzatmaqdan gedir.**

Təqribən 40-50 ildə insanın malik olduğu fiziki və mənəvi vəziyyəti uzun illər necə saxlamaq olar?

«Əbədi gəncliyə» çatmağın ən başlıca yolu fiziki mədəniyyətdir. Onun vasitələrindən istifadə etməklə bir çox peşə xəstəliklərindən qaçmaq olar və insan ömrünün son dəqiqələrinə qədər fəal, müstəqil yaradıcı həyat sürə bilər.

Oturaq həyat tərzi, zehni və psixoloji iş, radikulit insanların, o cümlədən müəllimlərin də psixastiniya, piylənmə, şəkər və bir çox başqa xəstəliklərə tutulmasına səbəb olur.

İnsan «birtərəfli» inkişaf etdikdə yalnız zehni məşğələlərə üstünlük verir. Əslində isə ruhi fəaliyyətə cavabdeh eyni mərkəzlərin məşqində ruhi və fiziki sahələr arasında bir növ uyğunsuzluq yaranır. Bu isə özlüyündə nevrotik halların inkişafına səbəb olur.

Öz kütləsinə görə əzələlər yaşlı adamın bədəninin çəkisinin 40 faizini təşkil edir. Bu, baş-beyin mərkəzləri tərəfindən idarə edilən güclü hərəkət aparatıdır. Bu aparatı məşq və inkişaf etdirməklə siz əzələ fəaliyyətini idarə edən sinir mərkəzləri üçün gözəl məşq yaratmış olarsınız.

Radikulit xəstəliyinin əmələ gəlməsinə səbəb fəqərələr arasında möhkəm elastik qığırdaq qatı-fəqərələr arası disklərin əyilməsidir, hərəkətsizlik üzündən oynaqlarda duzların yığılmasıdır. Qeyd etdiyimiz bu və digər xəstəliklərin qarşısını almaq üçün bədən tərbiyəsi ilə məşğul olmaq zəruri şərtlərindəndir. Atalar «Sağlam bədəndə sağlam ruh olar» deyiblər. Həqiqətən, müəllim özünü sağlam və gümrah hiss edərsə, onun əhval-ruhiyyəsi də xoş olar. Şübhəsiz ki, bu da tələbələrin əhval-ruhiyyəsinə müsbət təsir göstərər. Müəllim biliyi ilə yanaşı sağlam və gümrahlığı ilə də tələbəyə nümunə olmalıdır.

İbn Sina təsdiq edirdi ki, idmanla məşğul olan adamın heç bir müalicəyə ehtiyacı qalmaz. Onun müalicəsi hərəkətdir. Görkəmli pedaqoq K.D.Uşinski demişdir: «Zehni əməkdən sonra boş-bekar dayanmaq istirahət etmək deyil, mütləq fiziki işlə məşğul olmaq lazımdır, bu da nəinki adama xoşdur, hətta olduqca faydalıdır". Görkəmli alim İ.P.Pavlovun da sözlərini yada salmaq yerinə düşər: «Bütün ömrüm boyu mən zehni və fiziki əməyi sevmişəm və sevirəm. Düzünü desəm, ikincisini daha çox sevirəm. Fiziki işə hər hansı bir fikri də əlavə etdikdə, yəni başı əllərlə əlaqələndirdikdə özümü daha yaxşı hiss edirəm". Bax, həmin bu «başı əllərlə əlaqələndirməyi» də həkimlər yorğunluğun qarşısını alan bir vasitə kimi qiymətləndirirlər. Belə misalların sayını artırmaq da olar. Hər gün səhər gimnastikasından sonra az da olsa masajla məşğul olmaq yerinə düşər. Həftədə iki-üç dəfə idmanın başqa-başqa növləri ilə - qaçışla, voleybolla, stolüstü tennis və üzgüçülüklə məşğul olmaq, bardaş qurub əyləşməklə nərd oynamaq məsləhət görülür.

Hər axşam yatmazdan əvvəl təmiz havada yarım saata qədər gəzişmək, yaxud passiv hərəkət etməklə gimnastika ilə məşğul olmaq tez yuxuya getməyə kömək edir. Yuxarıda qeyd olunanlardan əlavə həftədə bir dəfə bədəni buxara vermək və həftədə bir dəfə bədənin bütün hissələrini masaj etmək yaxşı olardı. Bu tövsiyə olunanlara əməl etməklə insan uzun ömür sürər, həyatını dava-dərmansız, gümrah və şən əhvali-ruhiyyə ilə yaşayar.

**Tofiq CƏBRAYILOV,**
**Bədən tərbiyəsi kafedrasının**
**baş müəllimi, SSRİ**
**idman ustası, beynəlxalq**
**dərəcəli hakim**

# Kitabxanamız zənginləşir

1. Yusif Abulfat Mammadov, Zakir Farman Khankishiyev. "Differential". Baku, Publishing house of ASPU, 2013. 189 səh.

2. "Qarabağ: Folklor da bir tarixdir, IV kitab" ( Laçın, Qubadlı və Zəngilan rayonlarından toplanmış folklor örnəkləri). Bakı, "Elm və təhsil", 2013. 458 səh.

3. Dilsuz Musayev. "Qəlbimdə göyərən Vətən" (şeirlər, poema və tərcümələr) Bakı, "Şur",2013 472 səh.

4. Dilsuz Musayevin bu kitabında onun müxtəlif illərdə yazıb yaratdığı ayrı-ayrı kitab, jurnal və müxtəlif dövri mətbuat səhifələrində dərc etdirdiyi şeir və tərcümələri toplanmışdır.Magistrlərin VII elmi-praktik konfransının materialları. Bakı, ADPU, 2013. 728s.

5. Con Milton. Seçilmiş əsərləri. Bakı, "Şərq-Qərb Nəşriyyat Evi". 2013. 496 s.

6. Əzizxan Tanrıverdi. "Anarın nəsri". Bakı, "Elm və təhsil", 2013. 68 s.

Anarın bir sıra hekayə, povest və romanları 60-70-ci illər Azərbaycan nəsri müstəvisində təhlil edilir.

7. Nuruzadə Şubay Cavad oğlu. "Asiya və Afrika ölkələri tarixi". (XVII əsrin I yarısı və XIX əsrin 70 -ci illəri) Bakı, "Elm", 2013. 420 s.

Kitab Asiya və Afrika ölkələrinin yeni tarixindən bəhs edir. Burada hər bir ölkənin tarixinin ümumi və xüsusi cəhətləri öyrənilir.

8. İsmayılov İsa. "Fizikanın tədrisində yeni informasiya texnologiyalarından istifadə".(laboratoriya praktikumu) Bakı,2013. 176 səh.

Dərs vəsaiti ADPU-nun Fizika fakültəsində tədris olunan "Fizikanın tədrisində yeni informasiya texnologiyalarından istifadə"fənninə aid 20 mövzuda laboratoriya praktikumunu əhatə edir.

9. Buludxan Xəlilov. "Muasir Azərbaycan dili. Fonetika, yazı, əlifba, qrafika, orfoqrafiya, orfoepiya". Bakı Çap Evi. 2013. 312 səh.

Dərslikdə müasir Azərbaycan ədəbi dili anlayışı, müasir Azərbaycan ədəbi dili fənni və onun başqa elmlərlə əlaqəsi, müasir Azərbaycan ədəbi dili fənninin şöbələrində öyrənilən məsələlər şərh olunur.

10. Buludxan Xəlilov. "Dil söz çələngi". Bakı, "Bakı Çap Evi" 2013. 182 səh.

Kitaba görkəmli şəxsiyyətlərin, ictimai-siyasi xadimlərin, şairlərin, yazıçıların, filosofların bir qismindən, türk dillərinin müştərək yazılı abidələrindən Əhməd Yugnəkidən, Yusif Balasaqunludan, Cəlaləddin Rumidən, Əbu Turxandan, "Oğuznamədən" dillə bağlı seçmələr salınmışdır.

11. Buludxan Xəlilov. "Azərbaycan dili antologiyası". Bakı, Bakı Çap Evi, 2013. 648 səh.

Kitabda Azərbaycan dili ilə bağlı yüz illər boyu söylənilənlər, yazılanlar toplanmışdır.

12. Buludxan Xəlilov. "Türkologiyaya giriş". Bakı, "Bakı Çap Evi" 2013. 384 səh.

Dərslikdə dillərin morfoloji, türk dillərinin aqlütinativ, iltisaqi dillər kimi digər dil ailələri arasındakı yeri, eyni zamanda türk dillərinin digər dil ailələri ilə qohumluğu barədə mövcud olan cərəyanlar haqqında ( Ural-Altay, Altay, Skif dillər, Turan dillər cərəyanları) məlumat verilir.

13. Azer Turan. "Hüseyn Cavid Eserleri". İstanbul, 2013. 943 səh.

14. Məhəmməd Həsənov. "Seçilmiş əsərləri" ( III cild) Bakı, ADPU-nun mətbəəsi, 2013. 380 səh.

Pedaqogika üzrə elmlər doktoru, professor Məhəmməd Həsənovun "Seçilmiş əsərləri"nin III cildində müəllifin sintaksis və durğu işarələrinin tədrisi, eləcə də Azərbaycan dili dərsləirndə nitq inkişafı və əyaniliyin tədrisinin bəzi məsələlərinə dair əsərləri toplanmışdır.

15. F.A. Rüstəmov, İ.M. İsayev. "Pedaqoji irsimizdən. M.V.Vidadi, M.P.Vaqif, Q.B.Zakir". Bakı, "Elm və təhsil", 2013. 128 səh.

Kitabda Azərbaycan ədəbi-bədii və pedaqoji fikir tarixində görkəmli yer tutan M.V.Vidadi, M.P.Vaqif və Q.B.Zakirin pedaqoji fikirləri tədqiq edilir, gənc nəslin mənəvi -əxlaqi tərbiyəsində, şəxsiyyət kimi formalaşmasında bu gün də əhəmiyyətini itirməyən, aktuallığı ilə seçilən ədəbi-bədii əsərlərinin pedaqoji siqləti aşkarlanır.

16. Azərbaycan Regionları (Statistik məcmuə) Azərbaycan Respublikasının Dövlət Statistika Komitəsi 2013. 777səh.

17. Buludxan Xəlilov. "Dil. Ədəbiyyat, Mədəniyyət". Bakı. "Bakı Çap Evi" 2013. 484 səh.

Professor Buludxan Xəlilovun dil, ədəbiyyat, mədəniyyətlə bağlı məqalələrinin bir hissəsinin toplandığı bu kitab dilçilər, ədəbiyyatşünaslar, mədəniyyətşünaslar üçün dəyərli elmi mənbədir.

18. Tanrıverdi. "Dədə Qorqud Kitabı"nda dağ kultu". Bakı, "Elm və təhsil", 2013. 120 səh.

"Dədə Qorqud Kitabı"nda dağ kultu" professor Əzizxan Tanrıverdinin "Dədə Qorqud"un dilinə həsr etdiyi yeddinci kitabdır. Monoqrafiyada dağ kultu tarixi linqvistik müstəvidə araşdırılır.

19. Əzizxan Tanrıverdi. "Dədə Qorqud Kitabı"nın obrazlar aləmi. Bakı, "Nurlan", 2013. 392 səh

"Dədə Qorqud Kitabı"nın obrazlar aləmi filologiya üzrə elmlər doktoru, professor Əzizxan Tanrıverdinin "Kitabi-Dədə Qorqud"un dilinə həsr etdiyi səkkizinci kitabdır. Monoqrafiyada qəhrəman at və dağ obrazları, dilin finksiyaları, emotiv intonemlər və s. tarixi linqvistik müstəvidə tədqiq edilir.

20.Əzizxan Tanrıverdi "Dəli Kür" romanının poetik dili ədəbi tənqiddə. Bakı, "Elm və təhsil", 2013. 344 səh.

Kitab professor Əzizxan Tanrıverdinin "Dəli Kür" romanının poetik dili monoqrafiyası" (2012) ilə bağlı dövri mətbuatda çap olunmuş məqalələr, eləcə də həmin kitabın təqdimat mərasimindəki bəzi çıxışlar əsasında tərtib olunur.

21. Ramiz Mehdiyev. "Azərbaycanı dəyişmiş on il (2003-2013)" (kitab rus dilindədir) M.Qrif İK, 2013. 248 səh.

22. M.Ə.Əkbərov, R.K.Məmmədova, M.Ə.Mirzəyeva, K.O.İsgəndərova. "Üzvi kimyaın əsas anlayış və terminləri". Elmi-metodik vəsait.Bakı, "Elm", 2013. 489 səh.

Bu elmi-metodik vəsaitdə üzvi kimyanın əsas anlayış və terminləri qısa və aydın şəkildə izah olunmuşdur.

23. "Azərbaycan dilinin müxtəsər orfoepiya lüğəti". Bakı,ADPU-nun mətbəəsi, 2013. 146 səh.

24. "Dədə Qorqud araşdırmaları - I". Bakı, ADPU-nun nəşri, 2012. 310 səh.

"Dədə Qorqud elmi-tədqiqat mərkəzi"nin yeni dərgisinin ilk buraxılışında türk mədəniyyətinin tarixinə və ədəbinəzəri problemlərə həsr olunan araşdırmalar toplanmışdır.

25. Minaxanım Təkləli. "Türk əsilli ruslar I-II kitab". Bakı "Nurlan" Nəşriyyat-Poliqrafiya Mərkəzi, 2010. 328 səh.

Yazıçı türkoloq Minaxanım Təkləlinin kitabı türk mənşəli rus soyadlarının yaranma və formalaşma tarixinə həsr edilmişdir.

26. "Dədə Qorqud araşdırmaları - II". Bakı, ADPU-nun nəşri, 2013. 317 səh.

"Dədə Qorqud elmi-tədqiqat mərkəzi"nin yeni dərgisinin ilk buraxılışında türk mədəniyyətinin tarixinə və ədəbinəzəri problemlərə həsr olunan araşdırmalar toplanmışdır.

27. Ramazan Qafarlı. "Uşaq folklorunun janr sistemi və poetikası". Bakı, "Elm və təhsil", 2013. 540 səh.

Monoqrafiyada Azərbaycan uşaq folklorunun nəzəri əsasları, mənşəyi, yaranma yolları, toplanması, nəşri və araşdırılması tarixi, təsnifatı, lirik, epik, dramatik janrların poetikası, ideya məzmunu, ana nəğmələri (layla, oxşama, dilaçma) uşaq nəğmələri (düzgü, sanam, dolama, acıtma), tapmaca, yanıtmac, nağıl, oyu və tamaşaların spesifik xüsusiyyətləri ilk dəfə sistemli şəkildə təhlil edilir.

28. Zülfüqar Şahsevənli. "Görkəmli elm xadimi Yafəs Baxşəliyev". Qismət, Bakı, 2013. 232 səh.

"Görkəmli elm xadimi Yafəs Baxşəliyev" adlanan bu kitaba mənalı ömrünü Azərbaycanda elmin, təhsilin inkişafına sərf etmiş pedaqogika üzrə elmlər doktoru, respublikanın əməkdar müəllimi Yafəs Rəsul oğlu Baxşəliyev haqqında xatirələr toplanmışdır.

29. Mustafayeva S.S. "Qədim Azərbaycan dilində tayfa dili xüsusiyyətləri (oğuz- qıpçaq)". Bakı, "Bakı Universiteti", 2013. 168 səh.

Filologiya üzrə fəlsəfə doktoru, dosent Saidə Mustafayevanın bu monoqrafiyasında Azərbaycan dilinin ilkin təşəkkül və formalaşmasında türk tayfalarının iştirakı və həmin tayfa birliklərinin dil xüsusiyyətləri təhlil edilmişdir.

30. Əliyev Fazil Bəhmən oğlu. "Mirzə İbrahimov və xalq yaradıcılığı". Bakı, "Elm və təhsil", 2013. 160 səh.

Monoqrafiya XX əsrdə Azərbaycan xalqının milli mənlik şüurunun inkişafında böyük xidmət göstərmiş yazıçı, publisist və dövlət xadimi Mirzə İbrahimovun əsərlərində xalq yaradıcılığının tədqiqinə həsr edilmişdir.

31. Muxtaroğlu Ə.M. "Azərbaycan dilinin Şahbuz şivələrinin leksikası". Bakı, "Elm və təhsil", 2013. 180 səh.

32. İlyasov M.İ. "Müəllimin pedaqoji ustalığı". Dərs vəsaiti. Bakı, "Elm və təhsil", 2013. 216 səh.

Müəllimin pedaqoji ustalığı onu həm bir şəxsiyyət, həm də əsl müəllim kimi xarakterizə edən başlıca keyfiyyətlərdəndir. Pedaqoji usatalığa malik olan müəllim peşəsini və ixtisasını dərindən bilən, onu sevən və yüksək məharətlə gənc nəslə öyrədən müəllimdir.

33.Ələkbərov Urxan. "Davamlı insan inkişafı və ekoloji sivilizasiyanın əsasları". Ali məktəblər üçün dərslik. Bakı, "Təhsil", 2013. 224 səh.

Davamlı inkişaf XXI əsrin prioritetidir. Təqdim edilən dərslikdə davamlı insan inkişafı və ekoloji sivilizasiyanın planlaşdırılması və idarə edilməsi, bu istiqamətin sahələrarası elm kimi formalaşması, əsas anlayışları, nəzəri mənbələri barədə müfəssəl məlumat verilib.

34. Xəlil Rza Ulutürk. "Eşqim, vəfadarım mənim". Bakı, Naksuana, 2013. 580 səh.

Kitab Xəlil Rza və Firəngiz xanımın məhəbbəti haqqında salnamədir. Toplu Xəlil Rzanın ötən yüzilliyinin 50 -ci illərindən başlayaraq Firəngiz xanım haqqında yazdığı şerləri,gündəlikləri və məktubları əsasında hazırlanmışdır.

35.Xəlil Rza Ulutürk. "Hara gedir bu dünya". Şeirlər və poemalar. "Bakı", Qismət, 2009. 208 səh.

36. Pəri Paşayeva. Həsən Balıyev. Bakı, "Qismət" 2009. 208 səh.(şəkilli)

37. Salatın Əhmədova. "Heydər Əliyev və ədəbi tarixi proses" Bakı, "Elm" 2013. 156 səh.

Filologiya üzrə fəlsəfə doktoru Salatın Əhmədovanın bu monoqrafiyası dünya şöhrətli siyasətçi, müstəqil Azərbaycanın memarı, böyük mütəfəkkir Heydər Əlirza oğlu Əliyevin ədəbi-nəzəri irsinə həsr olunub.

38. Tağıyeva Z.Ə, Həsənov G.S, Əliyev E, Cəbrayılzadə S.C. "Turbo Pascal və Delphində proqramlaşdırma". Bakı, "Elm " 2013. 250 səh.

Kitabçada Turbo Paskal və Delpində proqramlaşdırmanın nəzəri və praktiki əsasları ardıcıl şəkildə şərh olunmuşdur.

39.Mədəd Namaz oğlu Çobanov. "Dilçilik məsələləri". Bakı, 2013. 284.

Kitabda müəllifin doktorluq dissertasiyasının avtoreferatı və müxtəlif jurnallarda, "Elmi əsərlər" də, həmçinin elmi konfranslarda etdiyi məruzələri və ya onların çap olunmuş tezisləri toplanmışdır.

40 Əliyev A.Ə. "Elektron paramaqnit rezonans hadisəsi və onun biologiyada tətbiqi".(Metodik vəsait) Bakı, 2013. 41 səh.

41. Zahid Xəlil. "Günəşi qopartmaq istəyən ayılar". Bakı, "Elm və təhsil", 2013.

**Nüşabə ƏMİRƏLİYEVA,**
**Elmi kitabxananın məlumat-biblioqrafiya şöbəsinin müdiri**

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Biologiya fakültəsinin dekan müavini, dosent **Nizam Mehdizadəyə** yaxın qohumu **Əliqəmbər Salahzadənin** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan tarixi kafedrasının dosenti **Firudin Cümşüdlüyə** anası **Rübabə xanımın** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumtexniki fənlər kafedrasının müəllimi **Təranə Mehdiyevaya** həyat yoldaşı **Hüseynin** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: A. Z. İSGƏNDƏROV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyov küçəsi-34, ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 1058
Sayı: 1500
Çapa imzalanıb: 28.02.2014-cü il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompyuter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.